**Müqəddimə**

Mərhəmətli və Rəhmli Allahın adı ilə

Həmd və səna Allaha məxsusdur. Ona həmd edirik, Ondan kömək diləyirik. Nəfslərimizin şərindən və əməllərimizin pisliklərindən Ona sığınırıq. Allahın hidayət verdiyi kəsi heç kim hidayət yolundan azdıra bilməz. Onun hidayət yolundan azdırdığı kəsi heç kim haqq yoluna yönəldə bilməz. Şəhadət veirirəm ki, Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur, təkdir, şəriki yoxdur. Və şəhadət verirəm ki, Məhəmməd Onun qulu və rəsuludur.

“**Ey iman gətirənlər! Allahdan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda (müsəlman kimi) ölün!”** (Əli-İmran, 102)

**“Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!”**(ən-Nisə, 1)

**“(Əgər belə etsəniz, Allah) əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (Cənnətə) nail olar. Biz əmanəti (Allaha itaət və ibadəti, şər’i hökmləri yerinə yetirməyi) göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən (götürüb özləri ilə**

**daşımaqdan) qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən, o çox zalım, çox cahildir. (İnsan bu ağır əmanəti götürməklə özünə zülm etdi və cahilliyi üzündən onun çətinliyini, ağır nəticəsini bilmədi)**”(əl-Əhzab, 71-72)

Həqiqətən, ən gözəl kəlam Allahın kitabı, ən xeyirli yol Məhəmmədin (s) hidayət yoludur. Əməllərin ən şəri sonradan edilmiş yeniliklərdir. Hər bir yenilik bidət, hər bir bidət zəlalət, hər bir zəlalətin axırı isə oddur.

Heç bir şübhə yoxdur ki, Allah taala insana çoxlu nemətlər bəxş etmişdir. Müsəlman olduqdan sonra bu nemətlərin ən dəyərlilərindən biri dillə həyata keçirilən nitq qabiliyyətidir. Bu dil iki istiqamətə malik silahdır: Quran oxumaq, yaxşı işləri əmr edib pis işlərdən çəkindirmək, məzluma kömək etmək kimi əməllər edərək Allaha itaətdə keçirmək hər bir müsəlmandan tələb olunan bir şeydir. Əgər belə olarsa, deməli, Allahın bu nemətinə şükr etmiş olarsan.

Bunu şeytana itaətdə, müsəlmanları parçalamaq, yalan, qeybət, müsəlmanların namuslarına toxunmaq, Allah və rəsulunun (s) haram buyurduğu başqa işlərdə istifadə etmək hər bir müsəlmana haram sayılır. Belə olduğu təqdirdə deməli, o, Allahın bu böyük nemətinə nankorluq etmiş olar.

Dilin iki böyük bəlası var: birincisi, batil danışmaq, ikincisi isə haqqı danışmamaqdır.

Haqqı danışmayıb onun barəsində susan adam lal şeytan kimi təsəvvür olunur. O, Allaha asi, riyakar, yaltaq və qorxaq olar. Batil fikirlər söyləyən isə danışan şeytandır. O, Allaha üsyankar olar. Insanlar onun dilindən zərər çəkərlər.

Dilin törətdiyi bəlalar insana ən təhlükəli olan bəlalardandır. Çünki, insan özünə biganə olub, haram yemək, zülm, zina, oğurluq, içki, harama baxmaq və bu kimi əməllərdən çəkinmədikcə, onun öz dilinə və dediklərinə hakim kəsiləcəyi mümkünsüz olur. Hətta, dindar və ibadət əhli kimi tanınan

insanlar da hərdən dillərinə sahib ola bilməyib xoşagəlməz ifadələr işlədirlər, bildiklərini də, bilmədiklərini də danışırlar. Həqiqətən, güc və qüvvət Uca və Böyük olan Allaha məxsusdur.

Allah taalanın kitabından və rəsulullahın (s) sünnəsindən bəhrələnərək, bu kitabçada Allahın izni ilə dilin fərd, cəmiyyət və bütün İslam ümməti üçün törətdiyi bəlaların təhlükəli olması barəsində söhbət açacağıq. Bu mövzu üç fəsildən və bir nəticədən ibarətdir.

Birinci fəsildə qeybət və adamlar arasında söz gəzdirmək barəsində danışacağıq. Qeybət doqquz, adamlar arasında söz gəzdirmək isə səkkiz hissədən ibarətdir.

Ikinci fəsildə söhbət açacığımız mövzu Allah barəsində elmsiz danışmaqdır. Bu da Allah və Onun rəsulunun (s) adından yalan danışmaq, ümumi yalan və yalan şahidlik başlıqları altındakı mövzuları əhatə edir.

Üçüncü fəsildə böhtan, kin bəsləmək və ədəbsiz sözlər danışmaq barəsində danışacağıq.

Topladığım bu məlumatları mötəbər mənbələrdən və elm süzgəcindən keçmiş kitablardan götürmüşəm. Əlbətdə ki, onların ən böyüyü və ən şərəflisi Qurani-Kərim və peyğəmbərin (s) pak sünnəsidir. Təmiz olan bu iki istinad nöqtəsi elə bir qaynaqdır ki, kim onu rəhbər tutub, azı dişləri ilə ondan yapışsa, nicat tapar, əğur əldə edər, kim onlardan üz çevirsə, ziyana uğrayar, zəlalətə düçar olar.

Həmçinin, qeyd olunan bütün hədislərin əsli mənbələrini göstərməyə çalışdım. Imam Buxari və İmam Müslimin “Səhih” əsərlərində olmayan hədislər olduqda isə, onlar barəsində hədis alimlərinin fikirlərini qeyd etdim.

Kitabı “Kitab və sünnə işığında dilin törətdiyi bəlalar” adlandırdım. Bu kitabı yazıb sona çatdırmağı Allah mənə müəssər etdi. Doğru nə varsa Tək və Lütfkar olan Allah tərəfindən, xətalar isə mən və şeytandandır. Allah və rəsulu (s) isə bu xətalardan uzaqdır.

Ərşin rəbbi olan Uca Allahdan Onun gözəl ad və sifətləri ilə diləyirəm ki, bu kitabı səmərəli, sağlığımda və ölümümdən sonra – **“Mal-dövlətin və övlad-uşağın fayda verməyəcəyi, yalnız sağlam qəlblə Allahın hüzuruna gələnlərin nicat tapacağı gün**” mənə faydalı etsin. Allah taala bunu oxuyanları, eşidənləri çap etdirib yayanları, çapına səbəb olanları və bu işə yaxından kömək edənləri öz cənnətlərinə daxil etsin! Həqiqətən, Allah duaları qəbul edər, ümüdləri boşa çixartmaz. O, istədiyinə kifayət edər, O, ən gözəl vəkildir. Güc və güvvət yalnız Ondadır. Qulu, rəsulu, yaratdıqlarının ən xeyirlisi, vəhyə sadiq, imamımız, peyğəmbərimiz, ibrət nümunəmiz və sevimlimiz Məhəmməd bin Abdullaya, onun ailəsinə, səhabələrinə və qiyamət gününədək ona gözəl şəkildə tabe olanlara Allahın salavatı və salamı olsun!

Allah taalaya
möhtac bəndə Səid bin Əli
bin Vahf əl-Qahtani hicri
13/11/1410

# BIRINCI FƏSL

## QEYBƏT VƏ ADAMLAR ARASINDA SÖZ GƏZDİRMƏK

**Qeybətin tərifi.** əl-Hafiz ibn Həcər (Allah ona rəhmət etsin!) buyurur: *"Alimlər qeybət barəsində ixtilaf ediblər. Üstün rəyə görə qeybət başqasının eybini ehtiyac olmadan dilə gətirməkdir"*.

Imam Qazali buyurur ki, *qeybət müsəlman qardaşının sonradan xəbəri olsa belə, xoşuna gəlməyən bir şeyi barəsində danışmaqdır.*

Ibn əl-Əsir "ən-Nihəyə" əsərində qeyd edir ki, *bir insan, başqasının eybi olsa belə onun xəbəri olmadan haqqında pis danışarsa qeybət etmiş olur.*

Nəvəvi İmam Qazaliyə istinadən yazdığı "Zikrlər" kitabında qeyd edir: *"Qeybət bir insanın başqası barəsində istəmədiyi bir şeyi xatırlamasıdır. Haqqında danışdığı şey onun şəxsiyyətinə, dininə, dünyasına, fitrətinə, əxlaqına, maddi imkanına, ailəsinə, paltarına, davranışına, danışığına və xasiyyətinə aid ola bilər. Bunları dillə tələffüz etməklə onun barəsində təsəvvür yaratmaq eynilik təşkil edir"*.

İbn Tin buyurur ki, *bir insanın xoşuna gəlmədiyi bir şeyi onun arxasınca danışmaq qeybət hesab olunur*.

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) buyurur: *"Çox yazarlar öz kitablarında "özlərini elmli hesab edən filankəslər", "dindar kimi tanınan filankəs" kimi ifadələr işlədirlər. Bunların hamısı qeybətdir. Qəribəsi burasındadır ki, qeybət edərkən "Allah bağışlasın bizi... deyərlər"*. ("Fəthul Bari" 10/469. Nəvəvinin "Zikrlər" kitabı, 288-290)

Qeybəti ifadə etmək təkcə dillə məhdudlaşmır. Əksinə qeybət xarakteri daşıyan hər bir hərəkət, yazı, işarə elə qeybətin özüdür.

**Qeybətlə adamlar arasında söz gəzdirməyin fərqi.** Əl-Hafiz ibn Həcər (Allah ona rəhmət etsin!) buyurur: “Qeybət və adamlar arasında söz gəzdirmək barəsində müxtəlif fikirlər mövcuddur. Onlar fərqli yoxsa eyni şeylərdir? Üstün rəy ondan ibarıtdir ki, onlar ayrı-ayrı şeylərdir. Həmçinin, onların ümumi və xüsusi cəhətləri var. Çünki, adamlar arasında söz gəzdirmək fəsad məqsədi güdərək bir şəxsin eybini razılıq olmadan başqasına çatdırmaqdır. Istər haqqındakı söhbətdən xəbəri olsun, istər olmasın!

Adamlar arasında söz gəzdirmək qeybətdən fəsad məq-sədi güdməsi ilə fərqlənir. Qeybətdə isə belə bir şərt yoxdur. Həmçinin, haqqında danışılan adamın xəbərsiz olması qeybətin fərqli cəhətidir. Qalan başqa şeylərdə isə onların ikisi də eynilik təşkil edir. Əksər alimlər haqqında danışılan insanın danışılan vaxtı orada olmamasını qeybətin şərti hesab edirlər. (“Fəthul Bari” 10/473)

**Qeybətin hökmü.** Heç bir şəkk-şübhə yoxdur ki, qeybət bütün müsəlman icmasının rəyinə görə haramdır. Kitab və sünnədə onun haram olmasına dəlalət edən bir çox açıq dəlillər var. (Nəvəvinin “əl-Əzkər”-nə bax! Səh; 289)

**Allah taala buyurur: “Allah pis sözün açıq (ucadan) deyilməsini sevməz. Yalnız zülm olunmuş şəxslər müstəsnadır. Allah (hər şeyi) eşıdəndir, biləndir!”.** (ən-Nisə, 148) **“Ey iman gətirənlər! Çox zənnə-gümana qapılmaqdan çəkinin. Şübhəsiz ki, zənnin bə′zisi (heç bir əsası olmayan zənn) günahdır. (Bir-birinizin eyibini, sirrini) arayıb axtarmayın, bir-birinizin qeybətini qırmayın! Sizdən biriniz ölmüş qardaşının ətini yeməyə razı olarmı?! Bu sizdə ikrah hissi oyadar (qeybət də belədir). Allahdan qorxun. Həqiqətən, Allah tövbələri qəbul edəndir, rəhmlidir!**”. (əl-Hücurat, 12) Allah taala

buyurur: "**Dalda) qeybət edib (üzdə) tə'nə vuran hər kəsin vay halına!".** (əl-Huməzə, 1) "**Dediyi hər sözü (yazmaq üçün) onun yanında hazır durub gözləyən (iki mələk) vardır**". (Qaf, 18) başqa bir ayədə isə Uca Allah belə buyurur: **"(Ey insan!) Bilmədiyin bir şeyin ardınca getmə (bacarmadığın bir işi görmə, bilmədiyin bir sözü də demə). Çünki qular, göz və ürək-bunların hamısı (sahibinin etdiyi əməl, dediyi söz barəsində) sorğu-sual olunacaqdır**". (əl-İsra, 36)

Qeybət dilin törətdiyi ən təhlükəli bəlalardan biridir. Əbu Hureyrənin rəvayət etdiyi hədisdə peyğəmbər (s) qeybəti belə başa salır: **"Siz bilirsiniz qeybət nədir?"** Dedilər: *Allah və rəsulu daha yaxşı bilir*. Dedi: **"Müsəlman qardaşının xoşuna gəlmədiyi bir şeyi onun haqqında danışmaqdır"**. Dedilər: *Əgər müsəlman qardaşımda həmin xislət varsa necə?* Dedi: **"Əgər dediklərin onda varsa qeybət etmiş olarsan. Əgər dediklərin onda yoxdursa, onda ona böhtan atarsan"**. (Müslim, 4/2000. Nəvəvi "Müslim"i şərh edərkən 16/142)

Ənəs bin Məlik rəvayət edir ki, rəsulullah (s) buyurur: **"Meracda olarkən dırnaqları ilə öz üzlərini və sinələrini cıran bir qövmün yanından keçdim. Cəbraildən onların kim olmasını soruşduqda mənə cavab verdi: onlar insanların ətlərini yeyən və namuslarına toxunanlardır"**. (Əbu Davud 4/269 "Övnul Məbud" 13/223 Şeyx Əbdulqadir Ərnavut bu hədisin həsən hədis olduğunu qeyd etmişdir. Bax; "Səhih əl-Cami" 5/51)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **"Müsəlman müsəlmanın qardaşıdır. Ona xəyanət etməz, yalan danışmaz, dönük çıxmaz. Bir müsəlmanın digər müsəlmana namusu, malı və qanı haramdır. Təqva məhz buradadır. Bir müsəlman digər müsəlmanı təhqir etməklə şərə rəvac vermiş olur"**. (Müslim 4/1984 Əbu Davud 4/273 Tirmizi 4/325)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan başqa bir hədisdə rəsulullah (s) buyurur: **“Bir-birinizə həsəd aparmayın, bir-birinizlə düşmənçilik aparmayın, bir-birinizə arxa çevirməyin! Biriniz digərinizin ticarətinə mane olmasın! Allahın qardaş qulları olun! Müsəlman müsəlmanın qardaşıdır, ona zülm etməz, dönük çıxmaz, təhqir etməz. Təqva məhz buradadır”.** (Müslim 4/1986 Tirmizi 4/325)

Şübhə yoxdur ki, ölmüş müsəlmanın qeybətini etmək diri olan müsəlmanın qeybətini etməkdən daha çirkin və daha günahdır. Çünki, qeybətin etdiyin diri insan bağışlaya və halallıq verə bilər, ölü isə yox. (Bax: Əbu Davudun “Sünən”inin şərhi “Övnul Məbud” 13/224) Aişədən rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Ölünüz öldükdə onun üçün dua edin, qeybətin etməyin!”** (Əbu Davud 4/275 bax: “Səhih əl-Cami” 1/279 Albaninin “Səhih hədislər toplusu” 285)

Əbu Bərza əl-Əsləmidən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə rəsulullah (s) buyurur: **“Ey dili ilə iman gətirib lakin, qəlbinə iman daxil olmayan kimsələr! Müsəlmanların qeybətini etməyin, onların qüsurlarını axtarmayın! Kim onların qüsurlarını axtarmağa çalışsa Allah onun qüsurunu aşkara çıxarar. Allah qüsurun aşkara çıxardığı kimsəni isə evində rusvay edər”**. (Əbu Davud 4/270 Əhməd 4/421,424 bax: Albaninin “Səhih əl-Cami” 6/308 rəqəm 3549)

Qeyd olunan hədisdə vurğulanır ki, müsəlmanın qeybətini etmək möminə yaraşmayan hərəkət, münafiqin isə şüarıdır. Həmçinin, hədisdə bildirilir ki, müsəlmanların eyiblərini axtaran insanların eyiblərini Allah aşkara çıxarar və eyibləri ailəsində ona göstərər. (Əbu Davudun “Sünən”inin şərhi “Övnul Məbud” 13/224) Həqiqətən də, güc və qüvvət Allaha məxsusdur.

Mustəvrad bin Şəddad (Allah ondan razı olsun!) rəvayət edir ki, peyğəmbər (s) buyurur: **“Kim müsəlmandan bir parça yesə, Allah taala Cəhənnəmdə o kəsə yediyinə oşxar bir şey yedizdirər. Kim müsəlmanda olan palrarı geyinsə, Allah taala Cəhənnəmdə o kəsə geyindiyinə oxşar geyim geydirər. Kim başqasına eşitdirmə və göstərmə məqsədi güdərək bir şey edərsə, Allah Qiyamət günü o kəsə etdiyinə oxşar münasibət göstərər”**. (Əbu Davud 4/270 Əhməd 4/229 Hakim onu səhih hesab etmişdir. Bax; “Səhih hədislər toplusu” 2/643 rəqəm 934) Bu hədisdə müsəlmanın qeybətini etməklə onun ətini yeyən, ona xəyanət etməklə paltarını geyinən insanlara Allah taala cəhənnəmdə oddan yedizdirər, geyindirər. Çünki, hər bir əməlin cəzası etdiyi əməl müqabilindədir. (Bax; “Övnul Məbud” 13/225) Allah hər şeyin ən yaxşı bilənidir.

Usəmə bin Şureyk (Allah ondan razı olsun!) rəvayət edir ki, bədəvilər heç bir günah olmayan şeylər barəsində peyğəmbərin (s) yanına gəlib “bunu etməkdə bizim üçün günah varmı?” deyirdilər. Peyğəmbər (s) isə onlara belə cavab verdi: **“Ey Allahın qulları, Allah taala günahı müsəlman qardaşının namusuna toxunan insanın boynuna yazar. Bu, günah və həlaka uğramaqdır”**. (Əhməd 4/278 Hakim 4/199, 4/499 İbn Macə 2/1137 Əbu Davud 2/211 Albani hədisin səhih olduğunu qeyd etmişdir. Bax; “Səhih əl-Cami” 6/294)

Səid bin Zeyd rəvayət edir ki, peyğəmbər (s) buyurur: **“Sələmin ən pisi haqsız olaraq müsəlmanın şərəfinə dil uzatmaqdır”**. (Əbu Davud 4/269 Əhməd 1/190 bax; “Səhih əl-Cami” 2/442)

Peyğəmbər (s) bəyan etdi ki, sələmin ən pisi müsəlmanı təhqir etmək, alçaltmaq, söymək və sairlə onun şərəfinə dil uzatmaqdır. Çünki, şərəf, ləyaqət və namus insana mal-dövlətdən daha əziz və qiymətlidir.

Rəsulullah (s) sələmi iki növə bölür: birincisi, borclu olan tərəfdən malın artıq hissəsini almaqdır. Ikincisi isə, haqsız

olaraq müsəlmanın şərəfinə, namusuna dil uzatmaqdır ki, bu da daha böyük günah və daha zərərli bir əməldir. (Bax "Övnul Məbud" 13/222) Haqlı olaraq danışmağa gəldikdə isə, elm əhlinin qeyd etdiyi şərtlər olarsa bu, caizdir. Qeybətin caiz olan hissəsini inşallah qeyd edəcəyik.

Əbu Hureyrənin rəvayətində bildirilir ki, rəsulullahın (s) yanına bir nəfər gəlir və ondan (s) zinadan təmizlənməyi istəyir. Istədiyini dörd dəfə təkrar etdikdən sonra rəsulullah (s) ondan soruşur: **"Sən zina etdin?"** O cavabında "bəli" deyir. Rəsulullah işi dəqiq öyrəndikdən sonra həmin adamın daşqalaq edilməsini əmr edir. Daha sonra rəsulullah (s) iki kişinin söhbətini eşidir. Biri digərinə deyir: "Gördünmü, o adamın etdiklərini? Sonra da onu iti daşqalaq edən kimi daşqalaq etdilər". Peyğəmbər (s) yaxınlıqda olan uzunqulağı görür və deyir: **"Fılankəs və fılankəs haradadır? Gedin, o uzunqulağı kəsin yeyin!"** Onlar dedilər: *Ey Allahın rəsulu, Allah səni bağışlasın, bunun əti yeyilərmi?* Rəsulullah (s) buyurdu: **"Haqqında danışdığınız qardaşınızın qeybətin etmək onu yeməkdən daha şiddətlidir. Nəfsim əlində olana and olsun ki, o, indi Cənnət çaylarında yuyunur"**. (Əbu Davud 4/148 , Beyhəqi 8/227, İbn Kəsir 4/216)

Cundub bin Abdulla (Allah ondan razı olsun!) buyurur ki, rəsulullahın (s) belə dediyini eşitdim: **"Kim eşitdirmək məqsədi güdərsə, Allah Qiyamət günü ona eşitdirər".** Həmçinin, rəsulullah (s) buyurur: **"Kim özünü yararsa, Allah Qiyamət günü onu yarar"**. Səhabələr dedilər: *"Bizə tövsiyə et!"* Rəsulullah buyurdu: **"Insanda çürüyən ilk şey onun qarnıdır. Kim yalnız gözəl olan şey yeməyi bacarırsa, onu etsin!"** (Buxari "Fəth" 13/128) Hədisdə müsəlmalara böhtan atmaq, onların barəsində pis sözlər işlətmək, onların eyiblərin axtarmaq onlara əllə və dillə əziyyət vermək və bu kimi əməllərin qadağan edilməsi nəzərdə tutulur. ("Fəthul Bari" 13/130)

**Müsəlman qardaşının qeybətini eşidən nə etməlidir**: İmam Nəvəvi (Allah ona rəhmət etsin!) buyurur: *"Bil ki, müsəlman haqqında edilən qeybəti eşidən hər bir kəs qeybət edənə cavab qaytarmalı və onun baş verməsinə mane olmalıdır. Sözlə mane ola bilməsən, əlinlə mane ol! Əllə və dillə mane olmağı bacarmırsansa həmin məclisi tərk et! Çünki, bir insan haqqında edilən qeybətə qulaq asmaq haqsızlıq və günahdır"*. (Nəvəvi "əl-Əzkar 294")

Atbanın (Allah ondan razı olsun!) məşhur olan hədisində qeyd olunur ki, peyğəmbər (s) namaz qılmağa qalxdı. Səhabələr Malik bin Duxşinin harada olduğunu soruşdular. Bəziləri isə onun Allah və rəsulunu sevməyən münafiq olduğunu söylədi. Peyğəmbər (s) buyurdu: **"Belə söyləmə, məgər görmürsənmi, o, "lə iləhə illallah" deyərək Allahın gül camalını görmək istəyir"**. Dedilər: *"Allah və rəsulu daha yaxşı bilir."* Biz burada rəsulullahın (s) münafiqlərə necə münasibət göstərdiyinin şahidi oluruq. Rəsulullah (s) buyurur: **"Allah taala "lə iləhə illallah" deyərək Allahın gül camalını görmək istəyən hər kəsə Cəhənnəmi haram etmişdir"**. (Buxari 1/110 Müslim 1/455)

Cabir bin Abdulla və Əbu Talhədən (Allah onlardan razı olsun!) rəvayət olunur ki, peyğəmbər (s) buyurdu: **"Bir müsəlman başqa bir müsəlmanın şəxsiyyəti və namusu tapdalanan yerdə ondan üz çevirərsə, Allah da ondan uğur əldə etmək istədiyi yerdə üz çevirər. Bir müsəlman başqa bir müsəlmanın şəxsiyyəti və namusu tapdalanan yerdə ona kömək edərsə, Allah da uğur əldə etmək istədiyi yerdə ona kömək edər"**. (Əbu Davud 4/271 Əhməd 4/30 Şeyx Albani bu hədisin həsən hədis olduğunu qeyd etmişdir. Bax; "Səhih əl-Cami əs-Sağir 5/160)

Əbu Dərdadan (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **"Kim müsəlman qardaşının namusunu qoruyarsa, Qiyamət günü Allah da onun üzünü oddan qoruyar"**. (Əhməd 6/450 Tirmizi 4/327 Şeyx Albani

hədisin səhih olduğunu qeyd etmişdir. Bax; “Səhih əl-Cami əs-Sağir 5/295)

Əsma bint Yəziddən rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Kim qeybət zamanı müsəlman qardaşının ətini yeməkdən üz çevirərsə, Allah onu oddan azad edər”**. (Əhməd 6/461 bax “Səhih əl-Cami” rəqəm 6116, 5/290)

**Qeybətin yaranma səbəbləri.** Aqil və müsəlman olan insan qeybəti yaradan səbəblər barəsində fikirləşdikdə bizim aşağıda qeyd etdiyimiz səbəbləri o da tapacaq:

Birinci səbəb: İnsan hər hansı bir işdə özünün qalib çıxmasına çalışdıqda qeybətə, böhtana və söz gəzdirmək kimi çirkin əmələ əl atır.

Ikinci səbəb: Başqalarına olan nifrət, kin-küdurət və düşmənçilik insanı qeybət etməyə sövq edir. Lakin, belə sifətlər möminlərdə, kamil iman sahiblərində olmaz. Allah bizi belə sifətlərdən qorusun!

Üçüncü səbəb: Özünü yüksəklərə qaldırmaq, başqalarını alçaltmaq istəyi qeybətə zəmin yaradır. Məsələn, “fılankəs cahil, zəif düşüncəli və iradəsizdir” deməklə, insan özünün hörmətli, güclü və belə qüsurlardan uzaq bir insan, başqasının isə səviyyəsiz olduğunu bildirərək özünü diqqət obyektinə çevirir. Bu, həmçinin özünə vurğunluqdur. Bu isə rəsulullahın bəyan etdiyi kimi insanı həlaka və məhvə aparan xislətdir. Allah bizi ondan və onun şərindən qorusun!

Dördüncü səbəb: Insan, Allahın qəzəbinə düçar olacağına baxmayaraq bəzən dostlarının, yoldaşlarının fikirlərinə uyğun gəlsin, onlara xoş getsin və onların razılığın qazansın deyə qeybətə əl atır. Bu da imanın zəifliyindən irəli gəlir.

Beşinci səbəb: Günah sahiblərinin günahına olan təəccübünü birüzə vermək qeybətin yaranmasına səbəb olur. Məsələn, insan “Fılankəs gördün nə elədi? Axı o, bilikli,

hörmətli və aqil bir insan idi. Yaraşardımı bunu etsin?" kimi ifadələr işlətdikdə qeybətin yarandığını anlamır.

Altıncı səbəb: Başqalarını məsxərəyə qoymaq, onlara qarşı istehza ilə yanaşmaq və təhqiramiz ifadələr işlətmək qeybətin yaranma səbəblərindəndir.

Yeddinci səbəb: Bəzən müsəlman olan insan belə başqasının günaha qurşandığını görüb, Allah yolunda qəzəblənərək öz qəzəbini birüzə verir və həmin şəxsin adını çəkərək "fılankəs necə də Allahdan həya etməyib bu cür iş görür". Daha o, bilmir ki, etdiyi belə söhbətdən artıq qeybətin içindədir. Bu da qeybətin yaranmasına səbəb olur.

Səkkizinci səbəb: Həsəd. İnsanlar birini tərifləyəndə, onun barəsində xoş sözlər işlədəndə və onu sevəndə qəlbində həsəd hissi olan kəs həsəd apardığı insanın sahib olduğu nemətin ondan getməsinə çalışır. Başqa çıxış yolu qalmadıqda isə qeybət, onun şərəf və ləyaqətini alçaltmağa əl atır ki, insanların ona olan məhəbbəti azalsın. Bu cür insan ən çirkin qəlbə və nəfsə sahibdir. Allah bizi bu cür əməldən və belə insanlardan qorusun!

Abdulla bin Amr (Allah onlardan razı olsun!) rəvayət edir ki, peyğəmbərdən (s) hansı insanın daha fəzilətli olduğunu soruşdular. Rəsulullah (s) buyurdu: **"Təmiz qəlbə və yalnız doğrunu danışan dilə malik olan insanlar"**. Soruşdular: *"Yalnız doğrunu danışan dili başa düşdük. Bəs təmiz qəlb nədir?"* Rəsulullah (s) buyurdu: **"Heç bir günah, azğınlıq, həsəd və nifrətin olmadığı təqvalı və təmiz qəlb"**. (İbn Macə rəqəm 4216 bax; "Səhih İbn Macə" 2/411 "Səhih hədislər" rəqəm 948)

Doqquzuncu səbəb: Bəzən insan ürəyində olan mərhəməti birüzə verərək başqalarının yanında "fılankə necə də kasıb adamdır, heç nəyi yoxdur. Lap onun dərdi məni alıb" kimi ifadələr də işlədərək qeybətə yol vermiş olur.

Onuncu səbəb: Qəlbi qara və pis fikirli insanlar bəzən gülmək, əylənmək və şənlənmək üçün başqalarını araya qoyub onların qeybətini aparırlar. Belə söhbətdən guya həzz alır, şənlənirlər. Söhbət artdıqca, yalan da artır, günah da artır. Rəsulullahın (s) aşağıda qeyd olunan hədisi bu cür insanlar barəsindədir: **“Vay o kimsənin halına ki, camaati güldürmək məqsədi ilə söhbət edər. Vay onun halına, vay!”** (Tirmizi 4/557 bax; “Səhih Tirmizi” 2/268)

On birinci səbəb: İnsanların qınaq hədəfinə çevirmək üçün günah olan bir əməli başqasına aid edərək ona böhtan atmaq qeybətin ən zərərli əlamətlərindəndir. (Bax; Əhməd bin Mühəmməd bin Həcər əl-Heysəminin “Qeybət çirkinliyinin eyiblərindən təmizlənmə” kitabı, İbn Teymiyyənin “Fitvalar”ı 28/236-238, 28/222-238)

**Qeybətin əlaci.** Qeybətdən yaxa qurtarmağın iki çarəsi var:

Birinci çarə ondan ibarətdir ki, insan qeybət etdikdə Allahın taalanın qəzəbinə tuş olduğunu bilməlidir. Bu barədə qeyd etdiyimiz hədislər və qeyd etmədiyimiz digər səhih hədislər buna dəlildir. Peyğəmbər (s) buyurur: **“Sizlərdən biriniz Allahın razılığını qazandıracaq bir söz danışanda, onunla görüşəcəyi günədək ona öz razılığını əta edər. Sizlərdən biriniz Allahın qəzəbini qazandıracaq bir söz danışarsa, onunla görüşəcəyi günədək onu öz qəzəbinə düçar edər”**. (Tirmizi 4/559 İbn Macə 2/1312 Malik “Muvatta” 2/985 Əhməd 3/469 Bax “Səhih Tirmizi” 2/269 “Səhih İbn Macə 2/358 “Səhih əl-Cami” 2/63)

Insanın yaxşılıqları Qiyamət günü qeybət etdiyinin əvəzi olaraq əlindən alınar. Əgər onun yaxşılıqları olmayıbsa, qeybət etdiyi insanın günahlarından ona gələr. Ola bilsin ki, tərəzinin günahlar olan gözü ağır gəlsin və həmin insan Cəhənnəmə daxil olsun! Deməli, qeybət Qiyamət günü ya yaxşılıqların getməsinə,

ya da əlavə günahlarla yüklənməyə səbəb olur. Sorğu-sualın, hesaba çəkilməyin isə buna heç bir qatışacağı yoxdur. Həqiqətən də, Allahdan başqa güc və qüvvət sahibi yoxdur!

Müsəlman olan insan qeybət barəsində varid olan mətinləri oxuyub iman gətirdikdə və əməl etdikdə, dilinə heç vaxt qeybət gəlməz. Həmin insan öz əməllərinə, öz eyib və qüsurlarına diqqət yetirər ki, bu da başaların eyiblərini axtarmağa və danışmağa rəvac verməz. Özündə qüsur və nöqsanlar olan kəs, bunları başqalarında necə axtara bilər? Bu sifət Allahdan həya edənlərə aid edilə bilməz. Allahdan həya edənlər də qeybətə yol verməz!

Ikinci çarə: Qeybətə yol verən insan qeybətin yaranma səbəbinə baxmalıdır. Qeybətin yaranma səbəbini həll etmək onun yenidən yaranmasının qarşısını alar. Qeybətin yaranma səbəbi qəzəbdirsə, onda qeybət edən kəs "mən qəzəbimə görə bunu etdimsə, buna görə də Allah taala öz qəzəbini mənə tərəf yönəldər. Allah bunu qadağan etdiyi halda mən asi oldum və ona önəm vermədim" kimi ifadə işlədib peşmançılıq hissi keçirməlidir.

Əgər qeybətin səbəbi başqalarının xoşuna gəlməsi və razılığını qazanması üçündürsə, onda həmin şəxs bilməlidir ki, məxluqun razılığını qazanmaq uğrunda Xaliqin qəzəbinə önəm verməyən kimsənin üzərindən Allah öz qəzəbini əksik etməz! Insan necə razı ola bilər ki, heç bir xeyir və ya zərər verə bilməyən yaradılmışların razılığını qazanmaq üçün Allahın qəzəbinə düçar olsun!

Əgər qeybətin səbəbi özünü təmizə çıxarıb başqalarının üzərinə günah atmağa görədirsə, insan bilməlidir ki, Allahın qəzəbinə düçar olmaq insan qəzəbinə tuş gəlməkdən daha şiddətlidir. Insan başqalarının qeybətini etməklə Allahın bu qəzəbini qazanmış olur. Həmçinin, bilmək olmaz ki, özünü insanların qəzəbindən qurtara biləcək, yoxsa qurtara bilməyəcək. Həmçinin, o da ola bilər ki, Allahın qəzəbinə

baxmayaraq insanların razılığını qazanmaq üçün etdiyi bu əməl həm Allahın, həm də insanların özlərinin qəzəbinə səbəb olsun…!

Əgər qeybətin səbəbi özünü təmizə çıxarıb daha çox fəzilət sahibi olduğunu nümayiş etdirmək istəyidirsə, insan bilməlidir ki, belə etməklə Allah yanında olan fəzilətini, hörmətini zay etmiş olar. Başqasını ləkələməklə insanlarda onda olan pis xüsusiyyətin səndə olmadığı görüntüsünü yaratmaq məqsədi güdmək qiymət və dəyərin itməsinə səbəb olar. Ola bilsin ki, insan olan hörmətini bu yolla insanların gözündə artırmaq istəsin. Lakin, əksinə olaraq həm Allah yanındakı fəzilətini, həmdə insanların gözündə dəyər-qiymətini yox etmiş olar. Çünki, insanların qəlbləri Allahın əlindədir. Bu qəlbləri istədiyi səmtə dəyişər. Ona görə də insan əməllərinə həssas yanaşmalı, onların görünən tərəfləri ilə qürrələnməməlidir.

Qeybətin yaranma səbəbi həsəd və paxıllıq olduqda iki əzabı özündə cəm edər. Çünki, insan dünya nemətinə paxıllıq etdikdə həsəd əzabına düçar olar. Paxıl olan kimsə isə dərd, kədər və sıxıntı hissi duyar. Belə ki, əzabın bir qismini qazanar. Buna qane olmadıqda isə Qiyamət günü olacaq digər bir əzab birinciyə əlavə olunar. Deməli, qəlbində həsəd və paxıllıq olan insan özündə həm dünya, həm də axirət xəsarətini cəm edər. O, həqiqətdə, həsəd apardığı insanın dostu, özünün isə düşmənidir. Çünki, o, qazandıqları savabları həsəd apardığı insanın savablarına əlavə edər. Savabları olmadıqda isə həsəd apardığı insanın günahları ilə yüklənər. O, həsəd apardığı insana qeybətlə və həsədlə ziyan və zərər vura bilməz. Əksinə, onun hörmətinin daha da artmasına səbəb ola bilər.

Qeybətin yaranma səbəbi başqasını lağa və məsxərəyə qoymaqdırsa, həsəd aparan kəs bilməlidir ki, o, başqasını insanların gözü özündə məsxərəyə qoymaqla özünü həm Allahın, həm də insanların yanında rüsvay etmiş olur. Qeybət edən kimsə öz qeybəti ilə başqasının halına acıdığını zənn

edirsə, yanılır. Çünki, bu cür düşüncə tərzi fəsada aparır. Çünki, o başqasının halına acıdığı halda, haram olan qeybətə yol vermiş olur. Əgər o, həqiqətən də mərhəmət nümayiş etdirirsə, bunu qeybət etmədən, tövsiyə, doğru yola yönəltmə və bu kimi bəyənilən üsullarla edə bilər.

Qeybətin yaranma səbəbi əyləndirmək və gülüş doğurmaqdırsa, qeybət edən bilməlidir ki, başqasının qeybəti ilə, başqasının dünya və axirətinə ləkə gətirib ona gülməklə özünü həlak edir. O, dünyada olarkən əzaba düçar olar. O, başqasının eyiblərini aşkara çıxarıb ona güldüyünə görə, Allah da onun eyiblərini dünya və axirətdə göz önünə sərər. Bundan daha biabırçı bir hal ola bilərmi?

Həqiqətən, aqil olan insan qeybətin yaranma səbəbləri və onun çarəsi baərsində fikirləşdikdə, burada qeyd olunan formalardan istifadə edərək onu həll etmək uğrunda çalışsa, inşallah qeybətin zərər-ziyanından əmində olar və dili yalnız xeyirli, faydalı sözlərin məskəninə çevrilər. Beləliklə də, həmin şəxs dünya və axirət xeyir-bərəkəti ilə mükafatlanar. Allahdan Onun gözəl ad və sifətləri ilə diləyirəm ki, bizim hamımızı sevib razı qaldığı, haqqı deyib ona ən çox əməl edən insanlardan etsin!

**Qeybət etməyə tövbə.** Müsəlmanın qeybətini edən kəs tövbə etmək üçün qeybət etdiyi insandan halallıq almalı, bağışlanma diləməlidir. Bu hal qeybətin fitnəyə gətirib çıxarmadığı təqdirdə edilir. Əgər qeybət ədavətə, xoşagəlməz başqa bir əməlin yaranmasına gətirib çıxarıbsa, qeybət edən qeybət etdiyi məclisdə və qeybət etdiyi insanlar arasında əleyhinə danışdığı insan barəsində yaxşı sözlər işlətməli, qeybətindən dolayı təssüfləndiyini bildirməlidir. Həmçinin, tövbə etmək istəyən insan tövbənin digər şərtlərini də yerinə yetirməlidir ki, tövbəsi tam və mükəmməl olsun! (Bax; “Qeybət çirkinliyinin eyiblərindən təmizlənmə” səh 62)

**Qeybətin icazə verildiyi məqamlar.**

Allah taala buyurur: "**Allah pis sözün açıq (ucadan) deyilməsini sevməz. Yalnız zülm olunmuş şəxslər müstəsnadır. Allah (hər şeyi) eşıdəndir, biləndir**". (ən-Nisə, 148)

Aişə (Allah ondan razı olsun!) buyurur ki, Müaviyənin anası Hind rəsulullaha dedi: *"Əbu Süfyan paxıl insandır. Mən onun malından gizlincə götürsəm mənim üçün günah olarmı?"* Rəsulullah (s) buyurdu: **"Sən və övladların lazım olan şeyi aşkarda götürün!"** (Buxari 3/36 "Fəthul Bari" 4/405)

Fatimə bint Qeys rəvayət edir ki, Əbu Amr bin Hifs yanında olmadan onu qəti surətdə boşadı. Və ona öz elçisini göndərdi. O dedi: *"Vallahi, bizim üzərimizdə sənin bir şeyin qalmayıb"*. Qadın isə rəsulullahın (s) yanına gələrək olanları danışdı. Rəsulullah (s) isə **"Sənin onun üzərində heç bir şeyin qalmayıb"** dedi və onun iddə vaxtını keçirmək üçün Ummu Şureykin evində qalmasını əmr etsə də sonradan dedi: **"O, elə bir qadındır ki, səhabələrim ondan ehtiyat edir. Ona görə də İbn Ummu Məktumun evində qal! O kor kişidir, üst paltarını rahatca çıxara bilərsən".** Qadın buyurdu ki, ona (s) Müaviyə bin Əbu Süfyanın və Əbu Cəhmin mənə evlənmə təklif etdiyini dedim. Rəsulullah (s) buyurdu: **"Əbu Cəhmə gəlincə, o əsasın çiynindən yerə qoymur.** (burada iki yozum var: birincisi, belə başa düşülür ki, həyatını səfərlərdə keçirir. Ikincisi isə onun qadınları çox vurmasına işarədir. Bu da, ən doğru yozumdur. Bax; İmam Nəvəvinin "Müslimin şərhi") **Müaviyə isə kasıbdır, imakanı yoxdur. Usəmə bin Zeydlə evlən!"** Qadın qeyd edir ki, mən onu istəmədikdə rəsulullah (s) Usəmə ilə evlənməyimi məsləhət gördü. Mən onunla evləndim. Allah da bizə xeyir-bərəkət əta etdi". (Müslim 2/1114)

Urva bin Zubeyr rəvayət edir ki, Aişənin bunları dediyini eşitdim: *"Bir kişi rəsulullahın (s) yanına daxil olmaq üçün izn istədi. Rəsulullah buyurdu:* **"İcazə verin! Yerlipərəs nə pis insandır."** Kişi daxil olduqda isə onunla yumşaq danışdı. Sonra

mən dedim: *“Ya rəsulullah, dediklərini dedin, sonra onunla yumşaq danışdın.”* Rəsulullah (s) buyurdu: **“Ey Aişə, insanların ən şərlisi o kəsdir ki, günahı ucbatından insanlar onu tərk edər”**. (“Səhih Buxari” 7/86 “Səhih Müslim” 4/2002 “Fəthul Bari” 10/471)

Buxari kitabının fəsillərindən birini “İnsanlar barəsində “uzun”, “gödək” kimi ifadələr işlətməyin icazəli olması” fəsli adlandıdır. Həmçinin, qeyd edir ki, rəsulullah (s) birinə “iki əlli” deməklə, onun pisliyini istəmirdi. (“Səhih Buxari” 7/85 “Fəth” 10/468)

Imam Nəvəvi qeyd edir ki, qeybətin dini məqsədlər üçün edilməsi altı səbəbdən caizdir:

Birincisi: Zülm olunarkən. Məzlum ona olunmuş zülmə görə sultana, qaziyə və ya rəhbər vəzifəsi olan insana şikayət edə bilər.

Ikincisi: Münkər bir əməli dəyişdirmək və günahkarı doğu yola qaytarmaq üçün kömək istəyərkən. Məsələn, kiminsə hər hansı bir günah etdiyini görərək imkanı olan şəxsdən “fılankəs belə bir günah edir, onu bu günahdan çəkindir” kimi sözlərlə kömək istəməsi dinin icazə verdiyi danışıq formasıdır.

Üçüncüsü: Fitva istəyərkən. Məsələn, müftinin yanına gələrək “fılankəs, yaxud atam və yaxud da qardaşım mənə qarşı bu cür zülm etmişdir. Mən ondan xilas olmaq üçün nə etməliyəm? Bu zülmü necə dəf edə bilərəm?” kimi ifadələr işlətməsi caizdir. Lakin, yaxşı olar ki, “bir kişi”, “bir ər”, “bir ata”, “bir övlad” kimi ifadələr işlətməklə müəyyən adamın adı çəkilməsin! Buna baxmayaraq hədisdə “Əbu Süfyan xəsis kişidir” kimi keçməsi müəyyən adamın adının da qeyd olunmasına icazə verir.

Dördüncüsü: Müsəlmanları şərdən çəkindirərkən. Bu bir neçə yöndən izah olunur:

a) Ravilərin, yazarların tənqidi, icma alimlərin rəyinə görə caiz, şəriəti qorumaq üçün isə vacibdir.

b) Məsləhətləşərkən qüsur barəsində xəbərdarlıq etmək. (buna dəlil əvvəldə qeyd olunmuş Fatimə bint Qeysin hədisidir. Bax; müslim 2/1114)
c) Həmçinin, birinin xarab, oğurluq mal və bu kimi əşyaları alarkən, fəsad törəkmək məqsədi güdmədən ona qüsurları bəyan edərək məsləhət vemrək dinin icazə verdiyi əməldir.
d) Fitnəkar bir insanın yanına gedib ondan elm öyrənmək istəyən insanın şahidi olduqda, onun bununla zərərə uğrayacağından qorxaraq, fitnəkarın eyiblərini göstərməklə məsləhət verməsi caizdir. Bu, həmçinin, müsəlmanların bir-birilərinə qarşı vəzifə borclarıdır.
e) Əmr sahihibi olan bir kəsin öz rəiyyətinə xidmət etmədikdə ondan yüksək əmr sahibi olan şəxsin onun barəsində danışıb tədbir tökməsində heç bir günah yoxdur.

Beşincisi: Fitnə və ya dinə əlavə olunmuş əməli aşkara çıxarmaq məqsədi ilə onu edən şəxsi ifşa etmək dinin icazə verdiyi qaydadır. Bu hal başqasına şamil olunmur.

Altıncısı: Müəyyən ləqəb verilmiş insanları həmin ləqəblərlə xatırlmaq günah sayılmaz. Məsələn, uzun, gödək, kor, axsaq və sair belə sözləri elə olduqlarına və həmin adlarla tanındıqlarına görə onlara aid etmək olar. Həmin insanları başqa adlarla xatırlamaq mümkündürsə, bu, daha yaxşı olar. Allah ən gözəlini biləndir. (Nəvəvinin şərhi 16/142 “Zikrlər” 292)

Qeyd olunanlardan belə qənaətə gəlmək olar ki, fitnənin yaranmaması, çoxalmaması üçün və müsəlmanları şərdən və şər insanlardan qorumaq məqsədi ilə qeybət etmək olar. Imam Buxari (Allah ona rəhmət etsin!) fəsillərindən birini də belə adlandırır: “Fitnə və şübhə əhlini qeybət etməyin icazəsi fəsli” (Urva bin Zubeyrin Aişədən rəvayət etdiyi hədis bunun təsdiqidir.) Həqiqətən də, əsas məqsəd müsəlmanların fitnədən

və şərdən uzaq olması və ümumiyyətlə bunların müsəlman cəmiyyətindən silinməsidir. (Bu, “Təhavi əqidəsi”ndə şer formasında öz təsdiqini tapır. Bax; səh 43)

## ADAMLAR ARASINDA SÖZ GƏZDİRMƏK

Adamlar arasında söz gəzdirmək nə deməkdir: Hafiz İbn Həcər (Allah ona rəhmət etsin!) İmam Qazalidən (Allah ona da rəhmət etsin!) nəql edərək bildirir ki, *adamlar arasında söz gəzdirmək danışılan sözü haqqında danışılan insana çatdırmaq, aşkara çıxarılması bəyənilməyən söz və ya hərəkəti birindən digərinə ötürməklə aşkara çıxarmaqdır. Çatdılılan xəbərin qüsur olub omaması fərq eyməz.* (“Fəthul Bari” “Səhih Buxari”nin şərhi 10/473 Nəvəvinin “Zikrlər” kitabı 298)

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) peyğəmbərin (s) **“Adamlar arasında söz gəzdirən Cənnətə girməyəcək”** hədisinini qeyd edərkən başqa bir rəvayətdə “**Qattət**” sözünün keçdiyini bildirir. Bunların hər ikisi eyni mənanı daşıyır. Daha sonra qeyd edir ki, alimlər adamlar arasında söz gəzdirməyi belə izah edirlər: İnsanlar arasında söz gəzdirmək, aralarında fəsad törətmək məqsədi ilə bəzi insanların söhbətini digərlərinə çatdırmaqdır. (İmam Nəvəvi “Müslim”i şərh edərkən 2/112)

Adamlar arasında söz gəzdirmək pis və çirkin məqsədlər güdərək danışılan söhbətin və ya baş verən hadisənin bir dildən başqa bir dilə keçməsi ilə üzə çıxmasıdır. (“Fəthul bari” 10/472)

Imam Buxari (Allah ona rəhmət etsin!) kitabında xüsusi olaraq “İnsanlar arasında söz gəzdirməkdə məkruh olan şeylər” başlıqığı altında fəsil ayırmışdır. Ibn Həcər (Allah ona rəhmət etsin!) qeyd edir ki, *alim bu başlıqla sanki, fəsad törətmək məqsədi ilə xəbərin birindən digərinə çatdırmağın icazəli olan tərəfi kimi, kafirlər barəsində xəbər verməyi nəzərdə tutmuşdur. Necə ki, kafir ölkələrində casusluq etməyin və ziyan verə biləcək*

*hadisə və ya söhbətlərin çatdırılması yolverilləndir.* ("Fəthul Bari" 10/472)

**Adamlar arasında söz gəzdirməyin hökmü.** Adamlar arasında söz gəzdirmək müsəlman icmasının rəyinə əsasən haramdır. Onun haram olmasını sübut edən dəlillər Qurani-Kərimdə və Peyğəmbərin sünnəsində kifayət qədərdir.

İnsanlar arasında söz gəzdirməkdən çəkinin! Allah taala buyurur: **"İtaət etmə (yalan yerə) hər and içənə, alçağa. Qeybət edənə, söz gəzdirənə. Xeyrə mane olana, (zülm etməkdə) həddi aşana, günaha batana**". (əl-Qələm, 11-12) Başqa bir ayədə Uca Allah buyurur: **"(Dalda) qeybət edib (üzdə) tə'nə vuran hər kəsin vay halına!**". (əl-Huməzə, 1)

Huzyfənin rəsulullahdan (s) belə eşitdiyi rəvayət olunur: **"Qəttat** (yəni, sözgəzdirən) **Cənnətə girməyəcək"**. (Buxari 7/76 Müslim 1/101 Bax; iki şeyxin ittifaq etdiyi hədislər toplusu olan "əl-Lülu vəl Mərcan" 1\2 "Fəthul Bari" 10/472) Qəttat adamlar arasında söz gəzdirəndir. Lakin, Müslimdə Əbu Vailin Huzeyfədən etdiyi rəvayətə görə deyilir ki, qəttatla adamlar arasında söz gəzdirənin fərqi var. Adamlar arasında söz gəzdirən hadisə və ya söhbətdə iştirak edir və onu başqasına çatdırır. Qəttat isə bilinməyəcək formada söhbətə qulaq asır və eşitdiklərini başqasına çatdırır. (Müslim 1/101)

Huzeyfə rəvayət edir ki, rəsulullahın (s) belə buyurduğunu eşitdim: **"Adamlar arasında söz gəzdirən Cənnətə girməyəcək"**. (Müslim 1/101) Əhli sünnə və Camaat məzhəbi qiblə əhlindən heç kəsi xüsusi dəlil olmadan etdiyi günahlara görə kafir adlandırmır.

Abdullah bin Məsud rəvayət edir ki, rəsulullah (s) buyurur: **"İnsan, doğru danışa-danışa Allah qatında doğru, yalan danışa-danışa yalançı tanınar".** (Müslim 4/2012)

İbn Abdul Birr Yəhyə bin Əbi Kəsirin belə dediyini rəvayət edir: *"Söz gəzdirən və yalançı insanın bir saatda*

*törətdiyi fəsadı sehrbaz bir ildə törədə bilmir”*. Söz gəzdirmək də sehrin bir növüdür. Çünki, o insanlar arasında təfriqəçilik salmaqla, sevgi ilə birləşən qəlbləri ayırmaqla sehrlə eyni xüsusiyyətlər daşıyır. (Bax; “Fəthul Məcid” “Tövhid kitabı”nın şərhi səh; 325)

**Söz çatdırılan insan nə etməlidir.** İmam Nəvəvi buyurur: Hər hansısa bir şəxs gəlib “Fılankəs sənin barəndə belə danışır” və ya “belə hərəkət edir” deməklə söz gəzdirirsə, mömin ona qarşı aşağıda qeyd olunan altı formada reyaksiya göstərməlidir:

Birincisi, onu təsdiq etməməlidir. Çünki, söz gəzdirən fitnəkar olur.

Ikincisi, onu bu əməldən çəkindirməli, ona tövsiyə etməli və əməlini pisləməlidir.

Üçüncüsü, Allah yolunda ona qəzəblənməlidir. Çünki, Allah taalanın qəzəbinə səbəb olanlar barəsində qəzəblənmək mömin yaraşan vacib əməldir.

Dördüncüsü, yanında olmayan qardaşı barəsində pis fikirləşməməlidir.

Beşincisi, ona fitnə törətmək niyyəti ilə danışılan şey barəsində pis fikirlərə düşməməlidir.

Altıncısı, söz gəzdirən insana qadağan etdiyi bir şeyi özünə rəva bilməməlidir. Çünki, ona danışılanı başqasına danışmaqla onun özü də söz gəzdirənə çevrilir… (İmam Nəvəvi bunları “Müslim”i şərh edərkən İmam Qəzalidən nəql edərək qeyd edir. 2/113 “Fəthul Bari” 10/473 Nəvəvinin “Zikrlər” səh 299)

**Ikiüzlülük.** Əbu Hüreyrədən rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Insanların ən şərlisi birinin yanında bu cür, digərinin yanında başqa cür olan ikiüzlü adamlardır”**. (Buxari 13/170, 6/526, 10/474 Müslim 4/2511)

İbn Həcər qeyd edir ki, bu, bir sözlə sözgəzdirən insanın sifətidir. Insanların ən şərlisi onların ikiüzlü olanlarıdır. Çünki, ikiüzlü insan münafiqin daşıdığı sifətləri özündə cəm edir. Ikiüzlü insan batini batil və yalanlarla dolu olmasına, insanlar arasında fitnə-fəsad törətmək istəməsinə baxmayaraq, özünü zahirdə təmasda olduğu insanları sevən biri kimi göstərər. Bu da özündə nifaq, yalan və yaltaqlıq sifətlərini birləşdirən və insanlar arasında qarşıdurma yaradan çirkin bir əməldir. Lakin, yaxşı məqsədlər üçün insanlar arasında onların xeyirləri barəsində danışmaq, birindən digərinə xoş sözlər çatdırmaq bəyənilən bir əməldir. (Bax; "Fəthul Bari" 10/475)

Ammardan (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **"Dünyada iki üzü olan kimsənin Qiyamət günü oddan iki dili olar".** (Əbu Davud 4/268 Albani bu hədisi səhih hesab etmişdir. Bax; "Səhih əl-Cami" 6372, 5/346 "Səhih hədislər toplusu" 889)

**Adamlar arasında söz gəzdirməyin yaranma səbəbləri.** Şək yoxdur ki, adamlar arasında söz gəzdirməyin yaranma səbəbləri qeybətin yaranma səbəbləri ilə eynidir. Lakin, bu səbəblərə bir neçə əlavələr də mövcuddur. Adamlar arasında söz gəzdirməklə məşğul olan insan fitnəkar olar, xəbər çatdırdığı insana yaxınlaşmaq məqsədi güdər. Sönməkdə olan atəşi yenidən alovlandırar, fitnə-fəsad törədər, toplumda ayrılıq toxumu səpər, insanların qəlblərində nifrət hissi yayar.

Adamlar arasında söz gəzdirməyin çarəsi, ondan xilas olmağın yolları qeybətin çarəsi ilə eynidir. Əvvəlki səhifələrdə bu barədə geniş söhbət açdıq.

**Söz çatdırmağın icazə verildiyi hallar.** Imam Nəvəvi (Allah ona rəhmət etsin!) buyurur: "Buna ehtiyac duyularsa, edilməsində qəbahət olmaz. Əgər biri başqa birisinə onu öldürəcəkləri, ailəsinə və malına ziyan vuracaqları ilə

xəbərdarlıq etsə, yaxud imamın və ya əmr sahibinin fitnədən qorunmaq üçün kimsə barəsində göstəriş verməsi icazə verilən hallardır. Əmr sahibinin belə halları aşkara çıxarması və aradan götürməsi vacibdir. Bu və buna oxşar əməllər haram deyil. Əksinə, bəzi hallarda bu əməlin yerinə yetirilməsi vacib, bəzi hallarda isə müstəhəbdir. Allah ən gözəl biləndir. (Bax; Nəvəvinin "Müslimin şərhi" 2/113)

Imam Buxari (Allah ona rəhmət etsin!) "Öz dostuna onun haqqında deyilənlər barəsində xəbər verməsi fəsli"ində İbn Məsudun belə rəvayət etdiyini xəbər verir: *"Bir kişi: Vallahi, Məhəmməd bu əməli Allahın razılığını qazanmaq üçün etməyib"* dedi. Mən də bunu gəlib rəsulullaha (s) xəbər verdim. Onun üzü qızardı. Sonra dedi: **"Allah Musaya rəhmət etsin! Ona bundan daha artıq əziyyət verməlarinə baxmayaraq, o, səbr etdi".** ("Səhih Buxari" 7/87 "Fəthul Bari" 10/475)

Burada bizim tənqid etdimiz və qınadığımız, fəsad törətmək məqsədi güdərək xəbərçilik etməkdir. Lakin, tövsiyə, xeyirxahlıq xarakteri daşıyan və insanlar arasında çətinliyi, düşmənçiliyi aradan qaldırıb yerinə sevgi və sevinc gətirmək məqsədi güdməklə birindən digərinə xəbərsiz olaraq söz çatdırmaq şəriətimizin bəyəndiyi əməllərdən biridir. (Bax "Fəthul Bari" 10/476)

## İKİNCİ FƏSİL

## ALLAH ADINDAN ELMSİZ DANIŞMAQ

**Allah və rəsulu adından yalan danışmaq.** Imam Nəvəvi (Allah ona rəhmət etsin!) deyir: *"Əhli sünnə və Camaatın rəyinə görə yalan, bilməyərəkdən və ya qəsdən bir şeyi olduğu kimi deyil, onun əksi barəsində xəbər verməkdir. Lakin, bilməyərəkdən yalan danışmaq günah sayılmaz. Yalnız bilərəkdən və qəsdən danışılan yalan günahdır"*. (Nəvəvinin "Zikrlər" 326)

Allah və rəsulu adından yalan danışmaqdan çəkin! Şübhə yoxdur ki, Allah və rəsulu adından yalan danışmaq başqaları adından yalan danışmaqdan daha böyük günah və daha çirkin əməldir. Allah taala buyurur: **"(Həmçinin erkək və dişi olmaqla) bir cüt dəvə və bir cüt inək. De: "(Allah) iki erkəyi, yoxsa iki dişini, yaxud da iki (müxtəlif cinsli) dişinin qarınlarındakı balaları haram buyurdu? Yoxsa Allah bunu (iddia etdiyinizi) sizə tövsiyə etdiyi zaman (orada) şahid idiniz? Heç bir biliyi olmadan insanları (haqq yoldan) azdırmaq üçün Allaha qarşı yalan uyduran şəxsdən daha zalım kim ola bilər? Həqiqətən, Allah zalım tayfanı doğru yola salmaz". (**əl-Ənam, 144**)**

Başqa bir ayədə Allah taala buyurur: **"De: "Bunu (haram saydıqlarınızı) Allah haram buyurmuşdur deyə, şəhadət verəcək şahidlərinizi gətirin!" Şayəd onlar (yalandan) şahidlik etsələr, sən onlarla birlikdə şahidlik etmə, ayələrimizi yalan hesab edənlərin və axirətə inanmayanların nəfslərinin istəklərinə uyma. Onlar (bütləri) öz Rəbbinə tay tutarlar".** (əl-Ənam, 150)

Allah taala buyurur: **"Ey iman gətirənlər! Etməyəcəyiniz bir şeyi niyə deyirsiniz? (Bə′zi müsəlmanlar: "Hansı əməllərin Allaha daha xoş**

**getdiyini bilsəydik, onları edər, malımızı və canımızı onların yolunda qoyardıq!" - deyirdilər. Lakin cihad əmri nazil olduqda bu, bir çöx mö'minlərin xoşuna gəlmədi). Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar".** (əs-Saf, 2-3)

Uca Allah buyurur: **"Allaha iftira yaxan və Onun ayələrini yalan hesab edən kəsdən daha zalım kim ola bilər?! Şübhəsiz ki, zalımlar nicat tapmazlar".** (əl-Ənam, 21)

Allah taala buyurur: **"Və ya: "Əgər bizə də kitab nazil edilsəydi, onlardan daha artıq düz yolda olardıq", - söyləməməyiniz üçün (göndərdik). Artıq Rəbbinizdən sizə açıq-aşkar bir dəlil, hidayət və mərhəmət gəlmişdir. Allahın ayələrini yalan hesab edib onlardan üz çevirəndən daha zalım kim ola bilər?! Ayələrimizdən üz çevirənləri üz çevirdiklərinə görə ən pis cəza ilə cazalandıracağıq". (**əl-Ənam, 157**)**

Allah taala buyurur: **"De: "Allaha qarşı yalan uyduranlar, sözsüz ki, nicat tapmazlar".** (Yunus, 69)

Başqa bir ayədə: **"Yalanı ancaq Allahın ayələrinə inanmayanlar uydururlar. Onlar əsl yalançıdırlar".** (ən-Nəhl, 105) **"Diliniz (bizə belə əmr edildiyi deyə) yalana vərdiş etdiyi üçün (dəlilsiz-sübutsuz): "Bu halaldır,o haramdır!" - deməyin, çünki (bununla) Allaha iftira yaxmış olursunuz. Allaha iftira yaxanlar (axirət əzabından) nicat tapmazlar".** (ən-Nəhl, 116)

Allah taala buyurur: **"Allaha iftira yaxan, özünə heç bir vəhy olunmadığı halda: "Mənə də vəhy olunmuşdur, mən də Allahın nazil etdiyi (Qur'an) kimi bir kitab endirəcəyəm", - deyən şəxsdən daha zalım kim ola bilər? Kaş sən zalımları ölüm əzabı içində çabalayan, mələklərin də (bu zaman) əllərini uzadıb: "Çıxarın canlarınızı! Siz bu gün Allaha qarşı nahaq sözlər danışdığınıza və Onun ayələrinə**

**təkəbbür göstərdiyinizə görə alçaldıcı bir əzabla cəzalandırılacaqsınız!" - dediklərini görəydin”.** (əl-Ənam, 93)

Başqa bir ayədə isə Uca Allah buyurur: **“De: "Rəbbim yalnız aşkar və gizli alçaq işləri (zana etmək, lüt gəzmək və s.), hər cür günahı, haqsız zülmü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram buyurmuşdur”.** (əl-Əraf, 33)

Əlidən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Mənim adımdan yalan danışmayın! Mənim adımdan yalan danışan oda girəcəkdir”.** (Buxari 1/35 Müslim 1/9 Bax; “əl-Lulu val Mərcan” 1/1)

Abdullah bin Zubeyr atasından rəvayət edir ki, mən Zubeyrə dedim: *Mən sənin filankəslər kimi rəsulullahdan (s) hədis rəvayət etdiyini eşitmirəm”.* O dedi: *“Mən onu tərk etməmişəm. Lakin, onun (s) belə buyurduğunu eşitmişəm:* “**Kim mənim adımdan yalan danışarsa, oddan hazırlanmış yerini hazır bilsin!”** (Buxari 1/35 “Fəthul Bari” 1/200)

Ənəs buyurur ki, *peyğəmbərin (s)* **“kim mənim adımdan bilərəkdən yalan danışarsa, onun üçün oddan hazırlanmış yerini hazır bilsin!”** *kəlamı məni sizə çoxlu hədis söyləməkdən çəkindirir”.* (Buxari 1/35 “Fəthul Bari” 1/201 Müslim 1/10)

Əbu Hureyrə rəsulullahın (s) belə buyurduğunu rəvayət edir: **“Məni öz adımla adlandırın! Kunyəmlə mənim adımı çəkməyin! Məni yuxusunda görən, deməli məni görmüşdür. Çünki, şeytan mənim surətimə girə bilməz. Və kim mənim adımdan yalan danışsa, onun üçün oddan hazırlanmış yerini hazır bilsin!”** (Buxari 1/36 “Fəthul Bari 1/202)

Sələmə bin Əkva peyğəmbərdən (s) belə eşitdiyini rəvayət edir: **“Kim mənim demədiyim bir şeyi mənim adımdan desə, onun üçün oddan hazırlanmış yeri hazır bilsin!”** (Buxari 1/35 “Fəthul Bari” 1/201)

Müslimdə keçən hədislərin birində peyğəmbər (s) buyurur: **"Mənim adımdan yalan olduğunu bilə-bilə bir hədis danışan yalançılardan biridir".** (Müslimin müqəddiməsi 1/9 İmam Nəvəvi "Müslimin şərhi" 1/65)

Muğira bin Şöbə peyğəmbərdən (s) belə eşitdiyini rəvayət edir: **"Mənim adımdan yalan danışmaq, başqası adından yalan danışmaq kimi deyil. Mənim adımdan qəsdən yalan danışan onun üçün oddan hazırlanmış yerini hazır bilsin!"** (Müslimin müqəddiməsi 1/11 İmam Nəvəvi "Müslimin şərhi" 1/65 Buxari 8/81)

Vasilə bin əl-Əsqadan (Allah ondan razı olsun!) rəvayət olunur ki, rəsulullah (s) belə buyurur: **"Böhtanların ən böyüyü başqasının onun atası olduğunu iddia etmək, gözlərinin görmədiyi bir şeyi görmüş kimi qələmə vermək və Allahın rəsulunun demədiyi bir şeyi onun adından danışmaqdır".** ("Fəthul Bari" 6/540)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə rəsulullah (s) buyurur: **"İnsanın hər eşitdiyini danışması, onun yalan danışmasına kifayətdir".** (Müslimin müqəddiməsi 1/10 Imam Nəvəvi "Müslimin şərhi" 1/65)

Abdulla bin Məsudun belə dediyi rəvayət olunur: *"İnsanların ağıllarının dərk etmədiyi bir hədisi onlara danışma! Əksinə, bu, bəzilərinin fitnəyə düşmələrinə səbəb olacaq".* (Müslimin müqəddiməsi 1/11 İmam Nəvəvi "Müslimin şərhi" 1/76)

Ömər bin əl-Xəttab (Allah ondan razı olsun!) buyurur: *"Bir insanın hər eşitdiyini danışması, onun yalan danışmağına bəs edər".* (Müslimin müqəddiməsi 1/11 İmam Nəvəvi "Müslimin şərhi" 1/65)

İbn Vahb deyir ki, Malik mənə belə buyurdu: *"Bil ki, hər eşitdiyini danışan insan salamat qalmaz. Ondan heç vaxt imam olmaz".* (Müslimin müqəddiməsi 1/11 İmam Nəvəvi "Müslimin şərhi" 1/65)

Əbdurrəhman bin Mehdi deyir ki, *bir kişi eşitdiklərinin bəzisini tərk etmədikcə, ondan nümunə götürülən imam olmaz”*. (Müslimin müqəddiməsi 1/11 İmam Nəvəvi “Müslimin şərhi” 1/65)

Peyğəmbərin (s) adından yalan danışmaq haramdır. Bu, böyük günah və çirkin bir əməldir. Lakin, bunu etmək küfr deyil. Onu halal hesab edənlər isə istisnadır. Bu icma alimlərinin görüşüdür.

Başqa bir rəyə görə onu qəsdən etmək küfdür. Bu görüş Şeyx Əbu Məhəmməd əl-Cuveyniyə məxsusdur. Lakin, onun oğlu iki müqəddəs haramın imamı və ondan sonra gələnlər bu fikri zəif hesab etdilər. Ibn Muneyr qeyd edir ki, *peyğəmbərin adından yalan danışmaq haram olan bir şeyin halal hesab edilməsinə gətirib çıxarırsa, bu artıq küfrdür.* Iki müqəddəs haramın imamı əvvəldə qeyd olunmuş fikri yalnış hesab edir. Imam Nəvəvi və Hafiz İbn Həcər cumhur alimlərin fikrini dəsdəkləyir. Bu fikir də ondan ibarətdir ki, bu əməli halal hesab edənlərdən başqası küfr etmiş olmaz.

Imam İbn Həcər deyir: “Peyğəmbərin adından yalan danışmaq böyük, başqasının adından yalan danışmaq isə nisbətən kiçik yalandır. Bunlar fərqlidir, bunları edənlər eyni cəzaya layiq deyillər. Rəsulullahın (s) onun adından yalan danışanlar barəsində **“yerlərini hazır bilsinlər”** kəlamı uzun müddətli əzabın olacağından xəbər verir. Hədisə zahirən diqqət verdikdə oradan çıxmayacaqları da başa düşülə bilər. Ancaq, qəti dəlillər onu göstərir ki, cəhənnəmdə əbəbi qalmaq kafirlərə xasdır. Peyğəmbər (s) onun adından yalan danışmaqla başqasının adından yalan danışmağı bir-birindən fəqləndirdi: **“Mənim adımdan yalan danışmaq başqa birinin adından yalan danışmaq kimi deyil”.** (Buxari 2/81 Müslim 1/10 Bax “əl-Lulu val Mərcan” 1/1) Hədislərin birində isə qeyd olunur ki, peyğəmbərin (s) adından yalan danışmaq fasiqlikdir. (Bu mövzu

barəsində demək olar ki, əvvəldən axıradək İmam Nəvəvinin şərhindən və “Fəthul Bari”dən iqtibas gətirilmişdir.)

Rəsulullahın adından yalan danışmaq Allahın adından yalan danışmaqdır. Çünki, Allah taala buyurur: ***“O, havadan danışmır. Yalnız ona vəhy olunan vəhydir”.*** (ən-Nəcm, 3-4) Peyğəmbərin (s) adından yalan danışmaq Allah taalanın bu ayəsində xatırlananlardır: **“De: "Allaha qarşı yalan uyduranlar, sözsüz ki, nicat tapmazlar”.** (Yunus, 69)

## YALAN

**Yalan danışmağın hökmü.** Imam Nəvəvi (Allah ona rəhmət etsin!) buyurur: “Qurani-Kərim və peyğəmbərin (s) sünnəsi bir cümlə ilə yalan danışmağın haram olmasınını aydın şəkildə bəyan etdi. Bu, ən pis əməllərdən və ən çirkin günahlardan biridir. Bütün müsəlman cəmiyyəti də varid olan dini mətinlərə əsasən onun haram olmasını qəbul edir. (İmam Nəvəvi “Zikrlər” səh 324) Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan səhih hədis yalandan uzaqlaşmağa kifayət edər. Peyğəmbər (s) buyurur: **“Münafiqin əlaməti üçdür: Danışanda yalan danışar. Vəd edərkən vədinə xilaf çıxar. Ona bir şey əmanət olunanda əmanətə xəyanət edər”.** (Buxari 1/14 Müslim 1/78)

Yalanın bütün formalarından çəkin! Allah taala buyurur: **“Bilmədiyin bir şeyin ardınca getmə (bacarmadığın bir işi görmə, bilmədiyin bir sözü də demə). Çünki qulaq, göz və ürək-bunların hamısı (sahibinin etdiyi əməl, dediyi söz barəsində) sorğu-sual olunacaqdır”.** (əl-İsra, 36)

Abdullah bin Məsud peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Həqiqətən, doğruluq yaxşılığa, yaxşılıq da Cənnətə aparır. Bir insan doğru danışa-danışa doğru insan olur. Yalan isə pisliyə, pislik də oda aparır. Bir insan yalan**

**danışa-danışa Allah qatında yalançı tanınır".** (Buxari 7/95 Müslim 4/2012 Bax; "əl-Lulu val Mərcan" 3/198)

Müslimdə keçən digər bir hədisdə isə peyğəmbər (s) buyurur: **"Doğru olun! Doğruluq yaxşılığa, yaxşılıq da Cənnətə aparır. Insan doğru danışdıqca, Allah qatında doğru insan kimi tanınır. Yalandan çəkinin! Yalan pisliyə, pislik də oda aparır. Insan yalan danışdıqca, Allah qatında yalançı kimi tanınır".** (Müslim 4/2013)

Imam Buxari özünün "Səhih" əsərində fəsillərin birini "Yalan və gizlətməyin alış-verişi məhv etməsi" adlandırır və arxasınca Həkim bin Hizamın (Allah ondan razı olsun!) peyğəmbərdən (s) rəvayət etdiyi hədisi misal çəkir: **"Alış-verişdə hər iki tərəf ayrılana kimi bir-biriləri ilə xeyirli olsunlar! Bu müddət ərzində doğru və heç nə gizlətməsələr, alış-verişləri bərəkətli olar. Yalançı olsalar və nələrisə gizlətsələr, alış-verişlərindəki bərəkət itər".** (Buxari 3/11 "Fəthul Bari" 4/313)

Bəhz bin Həkim atasından, o da öz atasından rəsulullahın (s) belə buyurduğunu eşitmişdir: **"Vay o kəsin halına ki, camaatı güldürmək üçün söhbət edər və yalan danışar. Yenə də vay olsun onun halına, vay!"** (Tirmizi 4/557)

Sumra bin Cundubdan rəvayət olunan uzun hədislərin birində peyğəmbər (s) öz röyasını danışır: **"Gecə gördüm ki, iki kişi gəldi, əlimdən tutdu və məni müqəddəs torpağa apardı. Bir kişi gördüm əlində dəmirdən qarmaq var idi. Onu çənəsindən salır və başının arxasına kimi uzadırdı. Və bunu təkrarən edirdi. Mən soruşdum ki, bu nədir? Mənə dedilər: Get! …"** Hədisin sonunda peyğəmbər (s) buyurur: **"Mən dedim: Bütün gecəni məni dolaşdırdınız. Indi mənə gördüklərim barədə xəbər verin! Dedilər: "Bəli, sənin gördüyün çənəsin yaran insan yalan danışan idi. O, o qədər yalan danışmışdır ki, yalanı üfüqlərə çatmışdır. O, sənin gördüyün bu hərəkəti ta qiyamətədək edəcək…"** (Buxari

2/104 “Fəthul Bari” 3/251) Buxaridə olan rəvayətdə isə peyğəmbərə (s) belə deyilir: **“Sənin, çənəsini, burnunu və gözlərini başının arxa tərəfinə dartan gördüyün insan o kəsdir ki, evindən çıxandan yalan danışmağa başlayar. Hətta, o qədər yalan danışar ki, yalanı üfüqlərə kimi çatar”.** (“Fəthul Bari” 12/439)

Əbu Hureyrənin rəvayət etdiyi hədisdə peyğəmbər (s) buyurur: **“Munafiqin əlaməti üçdür: Danışanda, yalan danışar. Vəd etdikdə, vədinə xilaf çıxar. Ona bir şey əmanət olunduqda, əmanətə xəyanət edər”.** (Buxari 7/95, 1/14 Müslim 1/78 Bax; “əl-Lulu val Mərcan” 1/12)

Ibn Abbasdan (Allah ondan və atasından razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Kim görmədiyi yuxunu danışarsa, o, iki arpa dənəsini birləşdirməyə məcbur edilər. Ancaq, bunu bacarmayacaq. Kim başqalarinin söhbətinə onların istəmədikləri halda qulaq asarsa, onun qulağından qiyamət günü qurğuşun tökəcəklər. Kim bir surət şəkli çəkərsə, ona əzab olunar və ona ruh üfürməsi məcbur edilər. Lakin, o bunu edə bilməyəcəkdir”.** (“Fəthul Bari”12/427)

**Nə zaman yalan danışmağa icazə verilir**. Ummu Kulsum bint Uqbə peyğəmbərdən (s) belə eşitdiyini rəvayət edir: **“Insanlar arasında mehribanlıq yaratmaq, xeyir toxumlarını əkmək və xeyr söyləyən yalançı olmaz”.** (Buxari 3/166 Müslim 4/2011 Bax; “əl-Lulu val Mərcan” 3/198)

Ummu Kulsumun rəvayətində qeyd olunur ki, peyğəmbər (s) insanlanların danışığında üç formada yalana icazə verir. Həmçinin, İbn Şihab rəvayət edir ki, peyğəmbər (s) insanların danışığında yalana üç şəkildə icazə verir: müharibədə, insanlar arasını düzəltməkdə və ərin arvada, arvadın da ərinə olan söhbətində. (Müslim 4/2011 Bax; Nəvəvinin “Zikrlər” 324 Burada, ağlı düşündürən bir çox faydalı məlumatlar var.)

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) buyurur: “Bu hədis xeyirxahlıq üçün danışılan bəzi yalanların icazəli olmasına açıq dəlildir. Alimlər ona bəzi qaydalar çərçivəsində icazə vermişlər. Bu barədə ən gözəl rəy İmam Əbu Həmid Qazalinin (Allah ona rəhmət etsin!) fikirləridir: “Söz məqsədlər üçün vasitədir. Bütün məqsədlərə doğruluq və yalanla çatmaq mümkündür. Burada, yalan ehtiyac duyulmadan haramdır. Məqsədə yalnız yalanla çatmaq mümkündürsə, orada doğru danışmağın yeri olmaz. Məqsədə çatmaq bəyənilən bir əməldirsə, orada yalan danışmaq daha yaxşıdır. Məqsədə çatmaq vacibdirsə, orada yalan danışmaq vacibdir.

Müsəlman başqa bir müsəlmanı zalımın zülmündən gizlətməlidir. Ondan müsəlmanın yerini soruşduqda, burada onu gizlətmək üçün yalan danışması vacibdir. Həmçinin, onda və ya bir başqasında mal olduğunu zalımın onu qəsb edəcəyindən qorxaraq gizlətməsi vacibdir. Əgər ondan and içməsini tələb etsələr, and içsin və doğru danışdığı görüntüsü yaratsın! Buradakı məqsədə çatmaq üçün yalnız yalan danışmaq gərəkirsə, yalan danışsın! O, əslində yalan danışmaq istəmir, zalımın zülmündən məzlumu gizlədir. Zahirən danışdığı yalan olsa da, o bundan günah qazanmaz. Belə şəraitdə yalan danışmaq haram sayılmaz. Əgər bir yerdə ki, doğru danışmaq fitnə-fəsadın yaranmasına gətirib çıxaracaqsa, orada yalan danışmaq üzürlüdür. Lakin, orada ki, doğru danışmaq keçərlidirsə, yalana ehtiyac yoxdursa, yalan danışmaq haramdır. (Nəvəvi “Zikrlər” 326)

Ibn Qeyyim (Allah ona rəhmət etsin!) qeyd edir ki, bəzi sələflər bu cür açıqlamalar sayəsində zülmdən xilas ola bilmişlər.

Ömər bin əl-Xəttabın belə buyurduğu rəvayət edilir: *“İnsanların nələrisə açıqlamalarında bəzən yalana ehtiyac duyulur”.* (“İğasətul Ləhəfən” 1/381)

Bəzi sələf alimlər buyurur ki, özlərini əzablardan və bəlalardan qorumaq üçün doğru olmayan bəzi ifadələr işlədirlər. ("İğasətul Ləhəfən" 1/381) Rəsulullah (s) bir neçə səhabəsi ilə olarkən müşriklərin dəstəsi ilə qarşılaşır. Onlar soruşurlar: *Siz kimlərdənsiniz?* Peyğəmbər (s) cavab verir: **"Biz sudanıq"**. Müşriklər bir-birilərinə baxıb: *"Bunlar yəqin Yəmən əhlidir. Onlar burada çoxdurlar"* dedilər və getdilər. (İbn Hişam "Peyğəmbər həyatı" 2/255)

Peyğəmbər (s) **"biz sudanıq"** deməklə Allah taalanın bu ayəsinə istinad edirdi: ***"Axan sudan yaradıldı".*** (ət-Tariq, 6)

Həmmadın (Allah ona rəhmət etsin!) yanına onunla oturmaq istəmədiyi biri gələndə əlini dişinə tutub: dişim! dişim! deyərdi.

Əhməddən Mərvazinin harada olmasını soruşdular. O da Əhmədin yanında idi. Lakin, çölə çıxmaq istəmədi. Əhməd barmağını ovucunun içinə qoydu və gələnlərə dedi: *Mərvazi burada deyil. O, burada nə edə bilər…?* Əhməd bu cür hiylə işlətməyi üç növə ayırmışdır:

1) Yaxınlaşmaq və itaət üçün. Bu, Allah qatında ən fəzilətli əməllərdəndir.
2) Caiz və bəyənilən əməllərdə bunu yerinə yetirən və ya tərk edən günah qazanmaz. Lakin, yerinə yetirmək tərk etməkdən daha yaxşıdır. Və ya şəraitdən asılı olaraq tərk etmək də olar.
3) Haram olan. Bu Allaha və onun rəsuluna (s) qarşı yalan danışmaqdır. Allahın vacib etdiyini dəyərsiz hesab etmək, dindən hesab etdiyini batil saymaq, haram etdiyini halal saymaq, sələfləri, imamları və hədis alimlərini inkar etmək bu növə aiddir. ("İğasətul Ləhəfən min Məsaidiş Şeytan" 1/384)

## YALAN ŞAHİDLİK

Uca Allah mömin qullarını vəsf edərkən onların yalandan şahidlik etmədiklərini buyurur.

Ey Allahın qulları, yalan yerə şahidlik etməkdən çəkin! Allah taala buyurur: **“Ey iman gətirənlər! (Şahidliyiniz) sizin özünüzün, ata-ananızın, yaxın qohumlarınızın əleyhinə olsa belə, ədalətdən möhkəm yapışan Allah şahidi olun! (Əleyhinə şahidlik edəcəyiniz şəxs) istər dövlətli, istər kasıb olsun, hər halda Allah onların hər ikisinə (sizdən) daha yaxındır. Nəfsinizin istəyinə uyub haqdan üz çevirməyin! Əgər dilinizi əyib büzsəniz və ya (doğru şəhadət verməkdən, yaxud ümumən şahidlikdən) boyun qaçırsanız, (bilin ki) Allah etdiyiniz işlərdən xəbərdardır”. (**ən-Nisə, 135)

**“Ey iman gətirənlər! Allah qarşısında (borcunuzu yerinə yetirməkdə) sabitqədəm və ədalətli şahidlər olun. Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu, təqvaya daha yaxındır. Allahdan qorxun. Allah etdiklərinizdən xəbərdardır”.** (əl-Maidə, 8)

Həmçinin, Allah taala buyurur: **“O kəslər ki, düzgün şəhadət verərlər. Və o kəslər ki, namazlarını (layiqincə) hifz edərlər. Məhz onlar cənnətlərdə ehtiram olunacaq (əzizlənəcək) kimsələrdir”.** (əl-Məaric, 33-35)

**“O kəslər ki, yalan yerə şahidlik etməz, faydasız bir şeylə rastlaşdıqları (lağlağı bir söhbət eşitdikləri) zaman onlardan üz çevirib vüqarla keçər”.** (əl-Furqan, 72)

Allah taala buyurur: **“Səfərdə olub katib tapmasanız, girov saxlayın. Əgər bir-birinizə e’tibar edirsinizsə, e’tibar olunmuş şəxs əmanəti geri qaytarsın və Rəbbi olan Allahdan qorxsun! Şahidliyi (şahidi olduğunuz şeyi) gizlətməyin! Onu gizlədən şəxsin qəlbi günahkardır. Allah etdiyiniz əməlləri biləndir”.** (əl-Bəqərə, 283)

**“Yoxsa siz İbrahimin, İshaqın, Yə’qubun və onun övladının (nəslinin) yəhudi və ya xaçpərəst olduqlarını iddia edirsiniz? Allah sizin nə etdiklərinizdən xəbərsiz deyildir”.** (əl-Bəqərə, 140)

**“Bunların (bu qadınların) gözləmə müddəti başa çatdıqda (barışmaq istəsəniz) onları yaxşılıqla (mehrlərini verib) yola salın. (Sonradan aranızda ixtilaf olmasın deyə) içərinizdən iki ədalətli şahid tutun. (Siz də ey şahidlər!) Allah üçün (doğru) şahidlik edin! Bununla Allaha və axirət gününə iman gətirənlərə öyüd-nəsihət verilir. Kim Allahdan qorxsa, Allah ona (hər çətinlikdən) bir çıxış yolu əta edər”.** (ət-Talaq, 2)

**“(Ey insanlar! Həccin sizə vacib olan əməli) budur. Və hər kəs (ihramda ikən) Allahın haram buyurduqlarına hörmət (riayət) etsə, bu, Rəbbi yanında onun üçün xeyirli olar. (Haram olduğu "Maidə" surəsində) sizə deyilənlərdən başqa, qalan heyvanlar (onların ətini yemək) sizə halal edilmişdir. Belə olduğu təqdirdə, murdar (başdan-ayağa murdarlıq olan) bütlərdən qaçın, yalan sözlərdən də (Allaha şərik qoşmaqdan da) çəkinin!”** (əl-Həcc, 30)

**“Bilmədiyin bir şeyin ardınca getmə (bacarmadığın bir işi görmə, bilmədiyin bir sözü də demə). Çünki qular, göz və ürək-bunların hamısı (sahibinin etdiyi əməl, dediyi söz barəsində) sorğu-sual olunacaqdır.”** (əl-İsra, 36)

Allah taala buyurur: **“De: "Rəbbim yalnız aşkar və gizli alçaq işləri (zana etmək, lüt gəzmək və s.), hər cür günahı, haqsız zülmü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram buyurmuşdur”.** (əl-Əraf, 33)

Imam Əbdürrəhman bin əl-Cövzi (Allah ona rəhmət etsin!) Allah taalanın bu ayəsi barəsində deyir: *“Bu ayə dində*

*elmsiz danışmağın haram olmasına işarədir”*. (“Zədul Məsir fi ilmit təfsir” 3/192)

Əbu Bukradan rəvayət olunur ki, peyğəmbər (s) üç kərə buyurur: **“Sizə ən böyük günahlar barəsində xəbər verimmi?”** Onlar dedilər: *Bəli, ya rəsulullah*! Peyğəmbər (s) buyurdu: **“Allaha şərik qoşmaq, valideynlərə asi olmaq”.** O, (s) dirsəklənərək oturdu və dedi: **“Və yalan şahidlik. Ondan çəkinin!”** bu sözləri o qədər təkrarladı ki, dedik indi susar. (Buxari 3/151 “Fəthul Bari” 5/261 Müslim 1/91 Bax; “əl-Lulu val Mərcan” 1/16)

Xuzeym bin Fatik əl-Əsədinin belə dediyi rəvayət olunur: *“Peyğəmbər (s) sübh namazın qılıb qurtardıqdan sonra ayağa qalxdı və dedi:* “**Yalan şahidlik Allaha şərik qoşmaqla eyni kimidir”.** Sonra bu ayəni oxudu: “**Murdar (başdan-ayağa murdarlıq olan) bütlərdən qaçın, yalan sözlərdən də (Allaha şərik qoşmaqdan da) çəkinin!**”. (İmam Əhməd “Müsnəd” 4/321 4/178)

Ənəsdən rəvayət olunur ki, peyğəmbərdən (s) böyük günahlar barəsində soruşdular. O (s) isə cavab verdi: **“Allaha şərik qoşmaq, valideynlərə asi olmaq və yalandan şahidlik etmək”.** (Buxari 3/151 Müslim 1/92 Bax; “əl-Lulu val Mərcan” 1/16)

İmam Buxari (Allah ona rəhmət etsin!) “Səhih” kitabının fəsillərinin birini “Allah taalanın kəlamına əsasən yalandan şahidlik barəsində” adlandırır və arxasınca bu ayəni misal gətirir: “**Şahidliyi (şahidi olduğunuz şeyi) gizlətməyin! Onu gizlədən şəxsin qəlbi günahkardır. Allah etdiyiniz əməlləri biləndir**”.

Neman bin Bəşir (Alllah ondan razı olsun!) rəvayət edir ki, anam atamdan mənə düşən mal barəsində soruşdu. O da mənə onu verdi. Anam isə rəsulullah (s) bunun şahidi olmayınca razılaşmayacağını bildirdi. Atam mənim əlimdən tutdu və peyğəmbərin yanına gətirdi. Bu uşağın anası məndən ona düşən

pay barəsində soruşur. Peyğəmbər (s) dedi: **“Sənin ondan başqa övladın var?”** O isə cavab verdi: Bəli. Daha sonra peyğəmbər (s) ona **“Mən heç vaxt zülmə şahidlik etmərəm”** buyurdu. (Buxari 3/151)

Imran bin Həsin (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Sizin ən xeyirliniz mənim əsrimdə yaşayanlardır. Sonra onlardan sonra gələnlər. Daha sonra onlardan sonra gələnlərdir”**. İmran deyir ki, *dəqiq bilmirəm peyğəmbər (s) bunlardan sonra başqa dövr qeyd etdi, ya yox*. Peyğəmbər (s) buyurur**: “Sizdən sonra elə bir camaat olacaq ki, xəyanətkar olacaqlar, əmanəti yerinə yetirməyəcəklər. Şahidlik edəcəklər, amma doğru olmayacaqlar. Nəzir deyəcəklər, amma onu yerinə yetirməyəcəklər”**. (Buxari 3/151)

Ubeydə, Abdullahın (Allah ondan razı olsun!) peyğəmbərdən (s) belə eşitdiyini rəvayət edir: **“İnsanların ən xeyirlisi mənim əsrimdə olanlardır. Sonra onlardan sonra gələnlər, daha sonra onlardan sonra gələnlərdir. Sonra elə bir camaat gələcək ki, onların şahidliyi andlarını, andları da şahidliyini geridə qoyacaq”.** (Buxari 3/151)

Abdullah bin Amr bin əl-As (Allah ondan razı olsun!) qeyd edir ki, bir bədəvi peyğəmbərin (s) yanına gəlir və ondan soruşur: *Ey Allahın rəsulu, böyük günahlar hansılardır?* Peyğəmbər (s) cavab verir: **“Allaha şərik qoşmaq”**. Bədəvi deyir: *Sonra hansı?* Peyğəmbər (s) buyurur: **“Valideynlərə asi olmaq”**. Bədəvi deyir: *Sonra hansı?* Peyğəmbər (s) buyurur: **“Batmış and”.** Mən soruşdum: *Batan and nədir, ya rəsulullah?* O, (s) cavab verdi: **“Yalanla müsəlmanın malını əlindən almaqdır”.** (Buxari “Fəthul Bari” 11/555, 12/264)

Peyğəmbər (s) onu batmış and adlandırır. Çünki, o, sahibini heç bir kəffarəsi olmayan günah içində və odda batırır. Əbu Hureyrə (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə dediyini rəvayət edir: **“Kim yalandan şahidlik etməyi, ona**

**əməl etməyi və cahilliyi tərk etməsə, bilsin ki, Allah onu yemək və içməklə imtahana çəkməyə ehtiyac duymaz”**. (Buxari 7/87)

Biz görürük ki, Allah taala yalandan şahidlik etməyi, haqqı məhv etmək məqsədi güddüyünə görə haram edir.

Yalandan şahidlik etməyin törətdiyi cinayətlər. Yalandan şahidlik etmək çox təhlükəli və zərərlidir. Çünki, o, bir çox cinayətlərin meydana gəlməsinə rəvac verir. Onlardan:

1. Yalandan şahidlik etmək hakimi haqdan azdırır, onun yanlış qərar çıxarmasına səbəb olur. Çünki, bəzi şeylər var ki, hökm onun üzərində qurulur. Iddia edən tərəf inkar edənə öz şahidi ilə təsir edirsə, şahidin yalan danışması məhkəmə prosesinin gedişinə mühüm təsir göstərir. Haqq qıraqda qalır, batil öz sözünü deyir. Peyğəmbər (s) buyurur: **“Mən bəşər övladıyam. Siz mənimlə mübahisə edirsiniz. Ola bilsin ki, bəziləriniz öz sübutu ilə digərlərinizdən səhvdir. Eşitdiyin kimi hökm ver”!** (Buxari 5/288)
2. Yalandan şahidlik edən özünə zülm etmiş olur. O, bu əməli etməklə Allah tərəfindən yalnız od qazanar. Peyğəmbər (s) buyurur: **“Siz mənimlə mübahisə edirsiniz. Ola bilsin ki, bəziləriniz öz subutu ilə digərlərinizdən səhvdir. Kim öz sözü ilə qardaşının haqqını ödəyərsə, ona gələn oddan bir parça kəsərəm və ona dəyməz”.** (Buxari 5/288)

3. Həmçinin, yalandan şahidlik etmək, əleyhinə şahidlik ediləni zülmə məruz qoyur. Belə ki, onun malını, mülkünü və haqqını yalan yerə şahidliklə əlindən alır. Həmçinin, bu zaman yalandan şahidlik edən məzlumun duası ilə qarşılaşır. Məlum olduğu kimi, məzlumun duası qəbul olunan və rədd edilməyən dualardandır. Onun duası ilə Allah arasında pərdə

olmaz. Peyğəmbər (s) buyurur: **“Üç nəfərin duası rədd edilməz”…** bunların içində “**məzlumun duası**”nı da qeyd etdi. **“Allah onun duasını buludlar üstünə qaldırar, onun üçün səmanın qapıları açılar və Allah buyurar: “İzzətimə və Cəlalıma and olsun ki, bir az sonra olsa da sənə mütləq kömək edəcəm”.** (Əbu Davud, Tirmizi 5/578 Bax; “Cəmiul usul” 4/145) Peyğəmbər (s) buyurur: **“Kim öz andı ilə müsəlmanın haqqını əlindən alsa Allah odu ona vacib, Cənnəti isə haram edər”**. Bir kişi ona (s) dedi*: Ya rəsulullah, kiçik bir şey olsa da?* Peyğəmbər (s) buyurdu: **“Kiçik bir ağac parçası olsa da”.** (Müslim 137, 1/122)

4. Yalan şahidlik etmək cinayətkarların cəzasız qalmalarına rəvac verir. Bu da yalan yerə şahidlik etməyin mövcud olmasını özlərində əsas tutan insanların cinayətlərə və günahlara qurşanmasına səbəb olur.

5. Yalandan şahidlik etmək qanunların çiynənməsinə və qadağaların edilməsinə gətirib çıxarır. Bununla günahsız insanlar əziyyət çəkir, haqsız yerə mal-mülk qəsb olunur. Məsələlər haqsız və ədalətsiz qərarlarla həll olunur. Bütün bunlara görə şübhəsiz ki, yalandan şahidlik edən Qiyamət günü hakimlərin Hakimi qarşısında cavab verəcək.

6. Yalandan şahidlik etməklə insan bu əmələ öyrəşir. Günahsızın cəzalandırılması və haqsız işgəncələrin olması get-gedə belə insanı maraqlandırmır. Artıq onun gözündə bunun günah olması itir. Zalımın əmrin icra edir, məzlumu isə əzir.

7. Yalandan şahidlik etmək Allahın dini barəsində haqqı olmadan və elmsiz danışmağa gətirib çıxarır. Həqiqətən, bu, ən böyük fitnələrdən, Allah yolundan çəkindirən ən zərərli səbəblərdən və insanların zəlalətə düşmələrinin ən mühüm amillərindən biridir. Bu, birbaşa Allah taalaya qarşı olmaqdır. Haqq ona bəyan olunduqdan sonra, cahilliyində, fitnəkar hərəkətlərində davam edib haqqı qəbul etməyən insan barəsində Allah taala buyurur: "**Diliniz (bizə belə əmr edildiyi deyə) yalana vərdiş etdiyi üçün (dəlilsiz-sübutsuz): "Bu halaldır,o haramdır!" - deməyin, çünki (bununla) Allaha iftira yaxmış olursunuz. Allaha iftira yaxanlar (axirət əzabından) nicat tapmazlar**". (ən-Nəhl, 116) Günümüzdə mövcud olan yalandan şahidlik etmək kimi çirkin bir əməl Allahın halal etdiyi şeyləri haram sayır və insanlara bunu belə təqdim edir. Bu əməlin ən təhlükəlisi ondan ibarətdir ki, haqqı bildikləri halda gizlədib, yerinə batili gətirib onu bəzəyirlər. Bunu da haqq kimi insanlara qəbul etdirməyə çalışırlar. Dünya və axirətdə salamat olmağı Uca rəbbimizdən diləyirəm. (Bax; Riyadda elmi təhqiqatlar, fitvalar və dəvət üçün baş idarənin nəşr etdirdiyi "Dini təhqiqatlar" jurnalı səh 255-272 Şeyx Abdullah bin Saleh əl-Qasir)

## BÖHTAN

Böhtan, iftira atmaq dilin törətdiyi ən böyük bəlalardan biridir. Allah taala Qurani-Kərimdə buyurur: **"İsmətli qadınla zina isnad edib, sonra (dediklərini təsdiqləyəcək) dörd şahid gətirə bilməyən şəxslərə səksən çubuq vurun və onların şəhadətini heç vaxt qəbul etməyin. Onlar sözsüz**

**ki, (Allahın itaətindən çıxmış) əsl fasiqlərdir. Bundan (namuslu qadınlara atdığı böhtandan) sonra tövbə edib özlərini islah edənlər istisna olmaqla. Çünki Allah (tövbə edənləri) bağışlayandır, rəhmlidir! Arvadlarına zina isnad edib özlərindən başqa şahidləri olmayanların hər biri özünün doğru danışanlardan olduğuna dair dörd dəfə Allahın adı ilə (Əşhədu billahi - Allahı şahid gətirirəm, deyə) şəhadət verməlidir. Beşinci dəfə: "Əgər yalan danışanlardandırsa, Allah ona lə'nət eləsin!" (deməlidir). Qadının da (hakimin hüzurunda) ərinin yalan danışanlardan olması barədə dörd dəfə Allahı şahid tutması əzabı ondan dəf edər. Beşinci dəfə: "Əgər (əri) doğru danışanlardandırsa, Allah ona (qadının özünə) lə'nət (qəzəb) eləsin!" (deməlidir)**". (ən-Nur, 4-9)

Allah taala buyurur: **"Zinadan xəbəri olmayan namuslu, ismətli mö'min qadınları zinada ittiham edənlər dünyada və axirətdə lə'nətə düçar olarlar. Onları (qiyamət günü) çox böyük bir əzab gözləyir. Qiyamət günü (onlar dünyada qazandıqları günahlarını dandıqda) dilləri, əlləri və ayaqları etdikləri əməllər barəsində onların əleyhinə şəhadət verəcəkdir".** (ən-Nur, 23-24)

Başqa bir ayədə isə Uca Allah buyurur: **"Həqiqətən, (Aişə barəsində) yalan xəbər gətirənlər öz içərinizdə olan bir zümrədir (münafiqlərdir). Onu (o xəbəri) pis bir şey zənn etməyin. O, bəlkə də, sizin üçün xeyirlidir. O zümrədən olan hər bir şəxsin qazandığı günahın cəzası vardır. Onlardan günahın böyüyünü öz üstünə götürəni (Abdulah ibn Ubeyyi) isə (qiyamət günü) çox böyük (şiddətli) bir əzab gözləyir".** (ən-Nur, 11)

Əbu Hureyrədən rəvayət olunur ki, peyğəmbər (s) belə buyurur: **“Yeddi şeydən çəkinin!”** Dedilər: *Ya rəsulullah, onlar hansılardır?* Peyğəmbər (s) buyurdu: **“Allaha şərik qoşmaq, sehr, haqsız olaraq Allahın haram etdiyi özünü öldürmək, sələm yemək, yetim malını yemək, döyüş vaxtı ordu sıralarını tərk etmək və namuslu mömin qadınlara böhtan atmaq”.** (Buxari 3/195 Müslim 1/92 Bax; əl-Lulu val mərcan” 1/17)

Ibn Ömərdən (Allah ondan və atasından razı olsun!) peyğəmbər (s) Minada vadisində olarkən buyurdu: **“Siz bilirsiniz, bu gün hansı gündür?”** Dedilər: *Allah və rəsulu daha yaxşı bilir*. Peyğəmbər (s) buyurdu: **“Həqiqətən, bu gün haram edilmiş günlərdəndir. Bəs, bilirsiniz, bura hansı torpaqdır?”** Dedilər: *Allah və rəsulu daha yaxşı bilir*. Rəsulullah (s) buyurdu: **“Bura haram edilmiş torpaqdır. Bəs, siz bilirsiniz, bu hansı aydır?”** Dedilər: *Allah və rəsulu daha yaxşı bilir*. Peyğəmbər (s) buyurdu: **“Haram edilmiş aylardandır. Həqiqətən, bu günün, bu ayın və bu torpağın haram olduğu kimi, Allah qanlarınızı, mallarınızı və namuslarınızı bir-birinizə haram etmişdir”.** (Buxari 7/83 “Fəthul Bari” 10/463)

Hafiz İbn Həcər (Allah ona rəhmət etsin!) qeyd edir ki, bu hədisdə keçən **namus** sözü ümumi məna ilə başa düşülür. Bu söz namus, qeyrət mənası ilə yanaşı, insanın şəxsiyyətini və insani keyfiyyətini də əhatə edir. (“Fəthul Bari” 10/464)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Müsəlmanın başqa bir müsəlmana qanı, namusu və malı haramdır”.** (Müslim 4/1986)

Əbu Hureyrənin (Allah ondan razı olsun!) başqa bir hədisdə peyğəmbərdən (s) belə eşitdiyini rəvayət edir: **“Kim mülkündə olan kimsəyə haqsız yerə böhtan atsa, Qiyamət günü özü dediyi kimi olanadək döyüləcəkdir”.** (Buxari 8/35

Müslim 3/1282 Bax; “əl-Lulu val Mərcan” 2/174) Müsəlmanın namusuna, heysiyyatına toxunmaq, şəxsiyyətini alçaltmaq, ona böhtan atmaq və kimi əməllərdən çəkindirən hədislər olduqca çoxdur. (Buxari 5/54 Müslim 4/2129 “əl-Lulu val Mərcan” 3/254)

## BATİL MÜBAHİSƏ

Mübahisə aparmaq iki cürdür: Birincisi, bəyənilən və edilməsi məsləhət bilinəm mübahisədir ki, bu da doğru yolla və xalis niyyətlə haqqı dəstəkləmək və ona çatmaq məqsədi ilə aparılan mübhisədir. (Bax; “Minhəcul cədəl fil Quranil Kərim” səh 50) Allah taala buyurur: **“İnsanları hikmətlə (Qur’anla, tutarlı dəlillərlə), gözəl öyüd-nəsihət (moizə) ilə Rəbbinin yoluna (islama) də’vət et, onlarla ən gözəl surətdə (şirin dillə, mehribanlıqla, əqli səviyyələrinə müvafiq şəkildə) mübahisə et. Həqiqətən, Rəbbin yolundan azanları da, doğru yolda olanları da daha yaxşı tanıyır”.** (ən-Nəhl, 125) Başqa bir ayədə Uca Allah buyurur: **“Kitab əhlinin zülm edənləri (cizyə verməyənləri, sizinlə vuruşmaq istəyənləri) istisna olmaqla, onlarla ən gözəl tərzdə mücadilə edin”.** (əl-Ənkəbut, 46) Ən gözəl şəkildə mübahisə etmək, elmlə, bəsirətlə, gözəl əxlaqla, gözəl söhbətlə, yumşaq, mülayim olmaqla, haqqa dəvət edib onu gözəlləşdirmək, batili rədd edib onun eybəcərliyini göstərməklə mümkündür. Burada məqsəd qələbə çalıb özünü ucaltmaq, tanıtmaq olmamalıdır. Məqsəd haqqı bəyan edib, insanları doğru yola çəkməkdir. (Bax; “Təfsiru İbn Kəsir” 2/592, 3/416 “Təfsirus Sədi” 4/254, 6/92)

Ikinci mübahisə forması isə bəyənilməyən, məzəmmət edilən mübahisədir ki, bu da batili dəstəkləmək, ona nail olmaq, elmsiz olmaq və sair bu cür xüsusiyyətləri əhatə edir. Bu növ olan mübahisə dilin törətdiyi ən böyük bəlalardan biridir. Allah taala buyurur: **“Allah haqqında heç bir şey bilmədən**

**(elmsiz-dəlilsiz "Rəbbimiz mələklərdən Özünə övlad götürmüşdür" - deyə) mübahisə edən və Allaha asi olmuş hər bir şeytana uyan insanlar da vardır. (Şeytan) haqqında əzəldən belə yazılmışdır (hökm edilmişdir): hər kəs onunla (Şeytanla) dostluq etsə, (Şeytan) onu yoldan çıxardıb cəhənnəm əzabına sürükləyər”.** (əl-Həcc, 3-4)

**“İnsanlar içində (Əbu Cəhl kimi) eləsi də vardır ki, heç bir şey bilmədən, haqq yolu göstərən heç bir rəhbəri (yaxud tutarlı dəlili) və nurani (səmadan endirilib hökmünü açıq bildirən) kitabı olmadan Allah barəsində mübahisə edər. O, boynunu (təkəbbürlə sağa-sola) əyərək (insanları) Allahın yolundan çıxarmaq məqsədilə bunu edər. Onu dünyada rüsvayçılıq gözləyir, qiyamət günü isə ona cəhənnəm odunun əzabını daddıracağıq”.** (əl-Həcc, 8-9)

Allah taala buyurur: **“Kafirlər isə batil (sözləri) ilə haqqı (Qur’anı) yalana çıxartmaq məqsədilə (Peyğəmbərlə boş-boşuna) mübahisə aparırlar. Onlar Mənim ayələrimi və (Peyğəmbər vasitəsilə) qorxudulduqları əzabı məsxərəyə qoyurlar”.** (əl-Kəhf, 56)

Başqa bir ayədə Uca Allah buyurur: **“Həcc ziyarəti vacib olan (həcci özünə vacib bilən) şəxsə həccdə olarkən (qadınla) yaxınlıq, söyüş söyüb pis sözlər danışmaq, dava-dalaş etmək yaramaz”.** (əl-Bəqərə, 197)

Cabir bin Abdulla (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Elmi alimlərin yanında öyünmək, səfehləri xor görmək və məclislərdə sırf fikir söyləmək üçün öyrətməyin! Kim belə etsə, onun üçün od var”.** (İbn Macə 1/93 Bax; “Səhih tərğib vət tərhib” 1/46 və “Səhih İbn Macə” 1/46)

Ibn Məsud buyurur ki, elmi üç şey üçün öyrətməyin: “*Səfehləri xor görmək, alimlərlə mübahisə aparmaq və insanların nəzərlərini özünə cəlb etmək üçün! Dediklərinizlə Allah qatında olanları istəyin! Çünki, qalan və davam edən budur. Qalanları isə fanidir”*. (əd-Dərami İbn Məsudddan mövquf olaraq rəvayət etmişdir. 1/70)

Əbu Uməmə əl-Bəhili (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Bir qövm hidayət olunduqdan sonra yalnız mübahisəyə yol verdiklərinə görə, zəlalətə düşər”.** (Tirmizi 5/378 İbn Macə 1/19 Əhməd “Müsnəd” 5/252, 256 Bax; “Səhih ət-Tirmizi” 3/103)

Peyğəmbər (s) Allah üçün batillik üzrə mübahisəni tərk edənlərə Cənnətdə bir ev veriləcəyinə zəmanət verir. Allahın rəsulu (s) buyurur: **“Kim haqlı olsa belə ikiüzlülüyü, zarafatda olsa belə yalan danışmağı tərk etsə, onlara Cənnətin ortasında evlərinin olmasına zəmanət verirəm. Və kim gözəl əxlaq sahibi olarsa, ona Cənnətin yüksək mərtəbəsində bir evi olacağına zəmanət verirəm”.** (Əbu Davud 4/253 Bax; “Camiul usul” 11/754)

**Batillik üzrə mübahisə etməyi yaradan səbəblər.** Şübhə yoxdur ki, batillik üzrə mübahisə aparmağın yaranma səbəbləri çoxdur:

1. Təkəbbürlük, özünü bəyənmə və başqalarını xor görmək.
2. Elmi və fəziləti özündə üzə çıxarıb nümayiş etdirmək niyyəti.
3. Başqalarına qarşı düşmənçilik məqsədi ilə nöqsanlarını üzə çıxarıb əziyyət vermək.

Bu pis xislətin çarəsi isə Allah taalaya tövbədir. Təkəbbürlüyünü, başqalarını xor görməyi, ədavəti yerə qoymaq və Allaha səmimi qəlblə bağlanıb tövbə etmək oda atılmağa

səbəb olan bu əməli tərk etməyin əlacıdır. Həqiqətən, bütün günahların həlli tövbədir. (Bax; Qazalinin "İhyəu ulumud-din" 3/116 və "Minhəc əc-Cədəl" səh 59)

## DÜŞMƏNÇİLİK və MÜNAQİŞƏ

Allah taala buyurur: **"İnsanların eləsi vardır ki, onun dünya həyatı haqqındakı sözləri sənin xoşuna gələr. O, qəlbində olana da (dili ilə ürəyinin bir olmasına) Allahı şahid göstərər. Halbuki, o, düşmənlərin ən qəddarıdır. (O şəxs səndən) ayrılan kimi yer üzündə fitnə-fəsad törətməyə, əkini və nəsli (islam cəmiyyətini) məhv etməyə çalışar. Halbuki, Allah fitnə-fəsadı sevməz! Ona: "Allahdan qorx!" - deyildiyi zaman lovğalıq onu günah törətməyə vadar edər. Beləsinə cəhənnəm kifayətdir. Ora nə pis məskəndir!"** (əl-Bəqərə, 204-206)

Aişədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə rəsullah (s) buyurur: **"Həqiqətən, Allah qatında ən kinli olan insan, qəlbində sərt düşmənçilik hissi yaşadandır".** (Buxari 5/106 Müslim 4/2054) Sərt kəlməsi böyük və şiddətli ədavət hissidir. Düşmənçilik isə ətrafında olanlara və ya olmayanlara qarşı sərt mövqe nümayuş etdirmək, haqsız olaraq və haqqı qəbul etmədən onlara zərər yetirmək anlamına gəlir. (Bax; İbn Əsirin "Camiul usul" 2/752 "Fəthul Bari" 13/2166)

Cabir (Allah ondan razı olsun!) rəsulullahın (s) belə buyurduğunu rəvayət etmişdir: **"Şeytan Ərəbistan yarımadasında namaz qılanların ona ibadət etməsindən artıq ümüdünü üzüb. Lakin, onlar arasında fitnə-fəsad törətmək istəyindən hələ əl çəkməmişdir"**. (Müslim 4/2166) Həqiqətən, şeytan müxtəlif vasitələrdən istifadə edərək namaz qılanlar arasına düşmənçilik, ədavət və kin salmaqla onları bir-biri ilə müharibəyə və çaxnaşmaya sürükləyir. (Bax; İbn Əsirin "Camiul usul" 2/752, "Fəthul Bari" 13/181)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə Allahın rəsulu (s) buyurur: **“Həqiqətən, Allah təkəbbürlü, kobud, bazarlarda cilddən cildə girən, gecə leş, gündüz uzunqulaq olan, dünya işlərindən xəbərdar axirətdən isə xəbərsiz olanların hamısına qəzəblənər”**. (Beyhaqi “əs-Sünənul Kubra” 10/194 İbn Hibban “Məvarid” 1975 səh 485 Bax; “Səhihul Cami” 1874, 2/144 “Səhih hədislər toplusu” 195, 1/171) Təkəbbürlü, kobud və kinli olan insanlar başqalarına nifrət edərlər. Allah da onlara bu xislətlərinə görə qəzəblənər. Həmçinin, peyğəmbər (s) hədisdə qeyd etdiyi **leş** və **uzunqulaq** sözləri ilə gündüz uzunqulaq kimi işləyib gecə hərəkətsiz leş kimi yatan Allahdan uzaqlaşdıran dünya üçün var güclə çalışıb Ona yaxınlaşdıran axirət barəsində fikirləşməyi tərk edən insanları nəzərdə tuturdu. (Bax; “əl-Əhədisus Səhihə” 1/172, “Feydul qadir şərhul Camius Sağir” 2/285)

Rəsulullah (s) başqa bir hədisdə belə buyurur: **“Həqiqətən, Allah pis və həddini aşan insanları sevməz”**. (Buxari “Fəthul Bari” 10/452 Müslim 4/2002 Əbu Davud 4/251) Pis və həddini aşan insanlar ona aid olmayan işlərə dil uzadan, nalayiq ifadələr işlədən özündən razı insanlardır. (Bax; İbn əl-Əsirin “Camiul usul” 11/739 “Feydul qadir şərhul Camius Sağir” 2/285)

Başqa bir hədisdə rəsulullah (s) üç dəfə təkrarlayaraq **“Inadkarlar həlak oldular”** buyurdu. (Müslim 4/2055) Burada işlədilən **Inadkarlar** hər şeyi bəyənmiyən, özündən razı, sözlərində və əməllərində hədlərini aşan kimsələrdir. (Bax; “Şərhun Nəvəvi”, İbn əl-Əsirin “Camiul usul” 11/733)

Həmçinin, rəsulullah (s) buyurur: **“Həqiqətən, Allah o insanı sevməz ki, o, inəyin öz dili ilə qatib-qarışdırdığı kimi, o da başqalarının işini qatıb-qarışdırar”.** (Tirmizi 5/141 Əhməd “Müsnəd” 2/165, 187 Bax; “Səhihut Tirmizi” 2/375) Həqiqətən də, inək qidalanarkən dilini dişlərinə və ağzına sürtür və fırladır. Insan da pis niyyətli, qəlbi nifrət və kinlə dolu olanda

hər vəclə hər şeyi bir-birinə qatır. Onun dili həm özünə, həm də yaşadığı topluma bəla olur. (Bax; Əbdürrauf əl-Munəvinin “Feydul qadir şərhul Camius Sağir” 2/283)

## DÜŞMƏNÇİLİK və QƏZƏBİN ÇARƏSİ

Hirslənərkən hirsi boğmaq, qəzəb və onu stimullaşdıran amillərdən uzaq durmaq, kin ədavət və düşmənçilik kimi çirkin əməllərdən qorunmağın ən mühüm səbəblərindəndir. Qəzəbin əlacı dini formada iki cür mümkündür:

1. Ona düşməkdən qorunmaqdır. Məlumdur ki, ondan qorunmaq ona düşdükdən sonra çarə axtarmaqdan daha xeyirlidir. Ona aparan səbəblərdən çəkinmək və uzaqlaşmaq ondan qorunmaq üçün ən mühüm köməkçi amillərdir. Gərək, buna nail olmaq istəyən hər bir müsəlman ona aparan təkəbbürlük, özünübəyənmə, başqalarını xor görmə, hərislik, boş yerə danışmaq və sair bu kimi səbəblərdən özünü təmizləsin! (Suhbi Məhməsani “əd-Dəaimul xalqiyyə val qavaninuş şəriyyə” səh 227)

2. Ikincisi isə qəzəb anında tapılan çarədir ki, bunlar da aşağıdakılardır: Birincisi, qəzəblənərkən lənətlənmiş şeytandan Allaha pənah aparmaq, (Bax; əl-Əraf, 200 əl-Muninun, 97 Fussilət, 36 Buxari 10/518 Müslim 4/2015) Ikincisi, dəstəmaz almaq, (Bax; Əbu Davud “Sünən” 4/249 “Təhzib əs-Sünən” 7/165-168 “Övnul Məbud” 13/141 Şeyx Əbduləziz bin Abdullah bin Baz onun sənədinin yaxşı olduğunu qeyd etmişdir.) Üçüncüsü, qəzəblənkən olduğu vəziyyətini dəyişdirmək: oturmaq, uzanmaq, çıxmaq kimi hərəkətlər, (Əhməd “Müsnəd” 5/152 Əbu Davud 4/249 İbn Hibban “Məvarid” 484 Heysəmi “Məcməuz zəvaid”də qeyd edir ki, Əhmədin raviləri etibarlıdır. 8/70 Bax; Bəğəvi “Şərhus sunən” 13/162)

## ƏDƏBSİZ SÖZLƏR

Ədəbsiz sözlər danışmaqdan çəkin! Allah taala buyurur: **"Onların gizli söhbətlərinin çoxunda xeyir yoxdur. Xeyir ancaq sədəqə verməyi, yaxud yaxşılıq etməyi və ya insanlar arasında sülh yaratmağı əmr edən kimsənin söhbətindədir. Allahın razılığını qazanmaq üçün belə işlər görən kimsəyə (axirətdə) böyük mükafat verəcəyik".** (ən-Nisə, 114)

İbn Kəsir (Allah ona rəhmət etsin!) **"Onların gizli söhbətlərinin çoxunda xeyir yoxdur**" kəlamı barərsində deyir*: "Yəni, insanların söhbəti".* ("Muxtəsəru təfsiru İbn Kəsir" 1/437)

Başqa bir ayədə Allah taala buyurur: **"Allah pis sözün açıq (ucadan) deyilməsini sevməz. Yalnız zülm olunmuş şəxslər müstəsnadır. Allah (hər şeyi) eşıdəndir, biləndir".** (ən-Nisə, 148)

Yəni Allah pis danışmağı və ədəbsiz sözlər işlətməyi sevməz. Məzlum isə istisnadır. Çünki, zülm olunmuş kəs ona zülm etmiş insana qarşı belə ifadələr işlədə bilər.

Ibn Abbas (Allah ondan və atasından razı olsun!) buyurur ki, burada Allahın sevmədiyi şey, zülmə uğrayanlardan başqasının kiminsə əleyhinə dua etməsidir. (Sabuni "Safvatu ət-Təfəsir" 1/314)

Uca Allah digər bir ayədə buyurur: **"Dediyi hər sözü (yazmaq üçün) onun yanında hazır durub gözləyən (iki mələk) vardır".** (Qaf, 18) Həmçinin, buyurur: **"Şübhəsiz ki, Rəbbin (bəndələrinin bütün əməllərini) baxıb görür".** (əl-Fəcr, 14)

Əbu Musa əl-Əşari deyir ki, bir gün rəsulullahdan (s) soruşdum: *"Hansı müsəlman daha fəzilətlidir?"* O, (s) mənə belə cavab verdi: **"O kəsdir ki, müsəlmanlar onun dilindən və əlindən zərər görməzlər".** (Buxari 1/9 Müslim 165)

Əbu Hureyrə (Allah ondan razı olsun!) peyğəmbərdən (s) belə eşitdiyini rəvayət edir: **"Həqiqətən, qul elə söz danışa**

**bilər ki, ona görə Cəhənnəmdə arası məşriq böyüklüyündə olan məsafədən daha uzaq yerə atılar”**. (Buxari 7/184) Müslimdə keçən hədisdə isə peyğəmbər (s) belə buyurur: **“Həqiqətən, qul elə söz danışa bilər ki, o söz onu Cəhənnəmdə məşriqlə məğribin arasındakı məsafədən daha uzaq yerə atar”.** (Müslim 4/2290 Bax; əl-Lulu val Mərcan 3/325)

Əbu Hureyrə (Allah ondan razı olsun!) rəvayət edir ki, peyğəmbər (s) buyurur: **“Həqiqətən, qul Allahın razılığı səbəbi ilə ağlına gəlmədən elə söz danışa bilər ki, onunla Allah onun dərəcəsini yüksəldər. Həqiqətən, qul Allahın qəzəbindən ağlına gəlmədən elə sözlər işlədə bilər ki, onunla Allah onu Cəhənnəmə atar”.** (Buxari 7/185)

Əbu Hureyrə (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Həqiqətən, insan heç bir eyib hesab etmədiyi bir şeyi Allahın qəzəbi ilə danışarsa, onunla Cəhənnəmdə yetmiş illik məsafə uzaqlıqdakı yerə atılar”.** (İbn Macə 2/1313 Tirmizi 4/557 Bax; “Səhih İbn Macə” 2/358 “Səhih ət-Tirmizi 2/268)

Əbu Hureyrədən rəvayət olunan digər bir hədisdə rəsulullah (s) buyurur: **“Allaha və axirət gününə iman gətirən kəs, ya xeyirli bir söz söyləsin, ya da sussun! Allaha və axirət gününə iman gətirən kəs, qonşusuna əziyyət verməsin! Allaha və axirət gününə iman gətirən kəs, qonağına ikram etsin!”** (Buxari 7/184 Müslim 1/68)

Səhl bin Səd (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Kim mənə iki saqqalı və iki qılçası arasında olan şeydən zəmanət versə, mən də onun Cənnətə daxil olmasına zəmanət verərəm”.** (Buxari 7/184 Tirmizinin rəvayətində isə **“Allah iki saqqalı və iki qılçası arasında olanın şərindən kimi qorusa, o Cənnətə daxil olar”** deyilir. Bax; “səhih ət-Tirmizi” 2/287)

Muğira deyir ki, mən peyğəmbərin (s) namazı qurtardıqdan sonra belə dediyini eşitdim: **“Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. O, təkdir, şəriki yoxdur. Mülk və həmd Ona məxsusdur. Və O, hər şeyə qadirdir”.** O, (s) bunu üç dəfə təkrarladı və dedi-qodunu, çoxlu sual verməyi malı zay etməyi, analara asi olmağı və yeni doğulmuş qız uşaqlarını diri-diri basdırmağı qadağan etdi”. (Buxari 7/183 Hədisin əvvəli də var.)

Bilal bin əl-Harisdən (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə dediyi rəvayət olunur: **“Həqiqətən, insan Allahın razılığı ilə özünün təsəvvür etmədiyi səviyyədə elə söz danışa bilər ki, Allah öz razılığını onunla görüşəcək günədək ona verər. Həqiqətən, insan Allahın qəzəbi ilə özünün təsəvvür etmədiyi səviyyədə elə söz danışa bilər ki, Allah öz qəzəbini onunla görüşəcək günədək onun üzərinə atar”.** (İmam Malik “Muvatta 2/985 Buxari 7/185 Əhlis Sunən Bax; “Səhih ət-Tirmizi 2/269)

Abdullah bin Məsud (Allah ondan razı olsun!) deyir ki, bir evdə olarkən orada iki qureyşli və bir səqəfli var idi. Onlar yekə qarın, lakin, zəif zəkaya malik insanlar idi. Onlardan biri dedi: *“Məgər bilmirsinizmi, Allah bizim dediklərimizi eşidir?”* Digəri isə*: “Biz ucadan danışsaq, eşidər. Gizlində danışsaq, bizi eşitməz”* dedi. Başqa biri isə dedi: *“O, bizim gizlində danışdığımızı eşidirsə, aşkarda ucadan danışdığımızı da eşidir”*. Daha sonra Allah taala bu ayəni nazil etdi: **“Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şəhadət verəcəklərinizdən qorxub (günah işləməkdən) çəkinmir, etdiyiniz əməllərin çoxunu isə Allahın bilməyəcəyini zənn edirsiniz”.** (Fussilət, 22) (Buxari 6/37 Fussilət surəsinin təfsiri, Müslim 4/2141 Bax; əl-Lulu val Mərcan 3/270)

Sufyan bin Abdullah (Allah ondan razı olsun!) belə rəvayət edir*: “Ey Allahın rəsulu, mənə elə bir şey danış ki, mən ondan tutunum”*. Dedi: **“De ki, mənim rəbbim Allahdır!**

**Sonra doğru yolla get!”** Dedim: *“Ey Allahın rəsulu, mənim üçün ən çox qorxduğun nədir?*” Peyğəmbər (s) öz dilini tutdu və dedi: **“Bax, bu!”** (Müslim 1/65 Əhməd “Müsnəd” 3/413 Tirmizi 4/607)

Əbu Hureyrənin belə dediyi rəvayət olunur: “Allaha and olsun ki, insan elə söz danışa bilər ki, onunla dünya və axirətini itirər”. (Bəğəvi “Şərhus Sunən” 14/385 Əhməd 2/328 Əbu Davud 4901)

Ibn Ömər (Allah ondan və atasından razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Allahı zikrdən başqa çox danışmayın! Həqiqətən, Allahı zikrdən başqa çox danışmaq qəlbi sərt və paslı edir. Allaha ən uzaq olan insanlar qəlbi sərt və paslı olanlardır”.** (Tirmizi 4/607 Tirmizi bu hədisi “Həsən ğarib” adlandırmışdır. Əbdülqadir əl-Ərnavut onun sənədinin yaşxı olduğunu qeyd etmişdir. Bax; Nəvəvi “Zikrlər” səh 285)

Əbu Səid əl-Xudri (Allah ondan razı olsun!) rəsulullahın (s) belə buyurduğunu rəvayət edir: **“Adəm övladı hər səhər durarkən bütün əzaları onun dilinə tabe olaraq deyir: Bizim işimizdə Allahdan qorx! Biz səninləyik. Əgər bizi doğru yola çəksən, biz elə o yolla da gedəcəyik. Əgər bizi əyri yola çəksən, biz elə həmin əyri yolla da gedəcəyik”**. (Tirmizi 4/615 Əbdülqadir əl-Ərnavut hədisin həsən olduğunu demişdir. Bax; Nəvəvi “Zikrlər” 286 və “Səhih Tirmizi” 2/287)

Muazın (Allah ondan razı olsun!) rəvayət etdiyi hədisdə peyğəmbər (s) dilini tutaraq dedi: **“Bundan qorun!”** Dedim: *“Ya rəsulullah, biz danışdığımızla danlanacağıqmı?*” Dedi: **“Anan səni itirsin, insanlar oda üzləri üstə dillərinin qazandıqları günahlar ucbatından girəcəklər”.** (Tirmizi 5/11 Və onun Həsən Səhih hədis olduğunu vurğulamışdır.)

Əbu Hureyrə (Allah ondan razı olsun!) rəvayət edir ki, peyğəmbərdən (s) insanı ən çox Cənnətə daxil edən əməlin hansı olduğu barəsində soruşdular. Peyğəmbər (s) dedi: **“Allahdan**

**qorxmaq və gözəl əxlaq sahibi olmaq".** Insanı ən çox oda salan şeyin nə olduğu barəsində soruşulanda isə, belə cavab verdi: **"Ağız və övrət yeri"**. (Tirmizi 4/363 Bax; "Səhih ət-Tirmizi 2/194)

## YAĞIŞI ALLAHDAN QEYRISININ ENDIRDIYINI ETIQAD ETMƏK

Zeyd bin Xalid əl-Cəhmi rəvayət edir ki, Hudeybiyyədə olarkən gecədən bəri göyü bulud almışdı. Peyğəmbər (s) sübh namazın qıldırdıqdan sonra camaata dedi**: "Siz bilirsiniz rəbbiniz nə dedi?"** dedilər*: "Allah və rəsulu daha yaxşı bilir".* Dedi: **"Qullarımdan səhərə mömin olanı da çıxdı, kafir olanı da. Kim "Allah bizə öz rəhməti və fəziləti ilə yağmur endirdi" dedisə, o, mənə iman gətirdi, ulduzları inkar etdi. Və kim "fılan fırtına, fılan bulud bizə yağmur endirdi" dedisə, o, məni inkar etdi, ulduzlara iman gətirdi"**. (Buxari 1/207 Müslim 1/83 bax; "əl-Lulu val Mərcan" 1/14)

## ALLAHDAN QEYRİSİNƏ AND İÇMƏK

Bureydə (Allah ondan razı olsun!) rəvayət edir ki, peyğəmbər (s) belə buyurur: **"Əmanətə and içən bizdən deyil".** (Əbu Davud 3/223 Bax; "Səhihul Cami" 5/282)

Ömər (Allah ondan razı olsun!) peyğəmbərin (s) ona belə dediyini rəvayət edir: **"Həqiqətən, Allah sizə atalarınıza and içməyi qadağan etmişdir".** (Buxari 7/221 Müslim 3/1266 Bax; "əl-Lulu val Mərcan" 2/170)

İbn Ömər rəvayət edir ki, Ömər bin əl-Xəttab süvarilər içərisində olarkən atasının canına and içir. Rəsulullah (s) bu halı görür və onları çağıraraq deyir: **"Məgər Allah sizə atalarınızın canına and içməyi qadağan etmədimi? And içmək istəyən ya**

**Allaha and içsin, ya da sussun!”** (Buxari 7/98 Müslim 3/1267 Bax; “əl-Lulu val Mərcan” 2/172)

İBn Ömər (Allah ondan və atasından razı olsun!) bir kişinin “Kəbəyə and olsun ki, yox!” deməsini eşidir. Ona belə deyir: *“Allahdan başqasına and içmə! Mən Allahın rəsulunun belə dediyini eşitmişəm:* **“Kim Allahdan başqasına and içsə, küfr və ya şirk etmiş olar”.** (Tirmizi və başqaları Bax; “Səhih ət-Tirmizi” 2/99)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan digər bir hədisdə peyğəmbər (s) buyurur: “**Kim and içərkən “Lat və Uzzaya and olsun!” deyə and içərsə, “lə iləhə illallah” desin! Və kim öz dostuna “gəl qumar oynayaq” desə, sədəqə versin!”** (Buxari 6/51 Müslim 3/1267 Bax; “əl-Lulu val Mərcan” 2/170)

## YALANÇI AND VƏ VERƏRKƏN MİNNƏT QOYMAQ

Allah taala buyurur: **“Ey iman gətirənlər! Sədəqələrinizi malını riyakarlıqla (özünü xalqa göstərmək üçün) sərf edən, Allaha və axirət gününə inanmayan şəxs kimi, minnət qoymaq və əziyyət verməklə puça çıxarmayın”.** (əl-Bəqərə, 264)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Allah Qiyamət günü üç şəxsə baxmaz, onları təmizə çəxarmaz. Onlar üçün ağrılı-acılı əzab var. Birinci, yol üzərində su quyusu olar, amma yoldan keçənləri ondan içməyə qoymaz. Ikincisi, imama dünya neməti üçün beyət edənlərdir. Ona bəxşiş verərkən razı qalar, verməyəndə isə nifrət edər. Üçüncüsü, öz malını satmaq istəyən satıcıdır ki, “Ondan başqa ilah olmayan Allaha and olsun ki, bunu fəlan qiymətə almışam” deyər, bununla da alıcının inanmasına nail olar”.** Daha sonra bu

ayəni oxudu: **"Allah ilə olan əhdlərini və andlarını ucuz bir qiymətə satan şəxslərə axirət ne'mətlərindən heç bir pay yoxdur. Allah qiyamət günündə onları dindirməz, onlara nəzər salmaz və onları (günahlarından) pak etməz (təmizə çıxarmaz). Onları şiddətli bir əzab gözləyir".** (Əli İmran, 77) (Buxari 3/75 Müslim 1/103 Bax; "əl-Lulu val Mərcan" 1/20)

Əbu Zər (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir**: "Allah Qiyamət günü üç şəxsi danışdırmaz, onlara baxmaz və onları təmizə çıxarmaz. Onlar üçün ağrılı-acılı əzab var"**. Rəsulullah (s) bunu üç dəfə təkrar etdi. Əbu Zər dedi: *"Onlar ziyana və uğursuzluğa uğradılar. Kimlərdir onlar, ya rəsulullah?"* rəsulullah (s) buyurdu: **"Təkəbbürlüklə paltarını uzadanlar, minnət qoyanlar və malını yalandan and içərək satanlar"**. (Müslim 1/102)

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan digər bir hədisdə peyğəmbər (s) buyurur: "**And içmək satışı artırar, amma bərəkəti məhv edər"**. (Buxari 3/12 Müslim 3/1228 Bax; "əl-Lulu val Mərcan" 2/156)

## ZAMANI SÖYMƏK

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **"Allah Azzə və Cəlla deyir ki, adəm övladı zamanı söyməklə mənə əziyyət verir. Zaman Mənəm. Bütün işlər mənim əlimdədir. Gecəni gündüzə qatanda Mənəm".** (Buxari 6/40 Müslim 4/1762 Bax; "əl-Lulu vaə Mərcan" 3/76)

## ÖLÜNÜN ARDINCA FƏRYAD QOPARMAQ

Ummu Atıyyə (Allah ondan razı olsun!) deyir ki, *beyət zamanı peyğəmbər (s) bizə beş qadının vəfatı səbəbiylə fəryad*

*qoparıb ağlamağı yasaqladı*. (Buxari 2/87 Müslim 2/645 Bax; "əl-Lulu val Mərcan" 1/188)

Əbu Malik əl-Əşari (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət etmişdir: **"Mənim ümmətimdə dörd şey cahiliyyə əlamətlərindəndir ki, onu hələ də tərk etməyiblər: hörməti olmaqla fəxr etmək, nəsil-nəcabətə tənə etmək, ulduzlardan yağmur endirməsini diləmək və ah-nalə qoparmaq. ah-nalə qoparan ölməmişdən əvvəl tövbə etməsə, Qiyamət günü əynində qətrandan libas, günahdan zireh olacaq".** (Müslim 2/644)

Ibn Məsuddan (Allah ondan razı olsun!) rəvayət olunur ki, peyğəmbər (s) belə buyurur: **"Yanaqlarına vuran, üst-başını cıran və cahillik adətləri ilə çığır-bağır salan bizdən deyil".** (Buxari 2/83 Müslim 1/99 Bax; "əl-Lulu val Mərcan" 1/19)

## LAYIQ OLMAYAN INSANI TƏRIFLƏMƏK VƏ IFRATA VARMAQ

Əbu Bəkr (Allah ondan razı olsun!) rəvayət edir ki, bir kişi peyğəmbərin (s) yanında başqasını təriflədi. Peyğəmbər (s) dedi: **"Vay olsun sənə! Sən dostunun boynunu vurdun, sən dostunun boynunu vurdun. Kim qardaşını yersiz yerə tərifləyərsə, belə desin: Hesab edirəm ki, fılankəs bu cürdür. Mən onu Allah qarşısında təmizə çıxarmıram. Onda belə xislət olduğuna görə, onu belə insan tanıyıram"**. (Buxari 3/158 Müslim 4/2296 Bax; "əl-Lulu val Mərcan" 2/328)

Əbu Musa (Allah ondan razı olsun!) rəvayət edir ki, peyğəmbər (s) bir kişinin başqa bir kişini tərifləməsini eşidir və deyir: **"Həmin kişinin belini yerə vurdunuz və onu həlak etdiniz".** (Buxari 3/158 Müslim 4/2297 Bax; "əl-Lulu val Mərcan" 3/328)

İbn Bəttal deyir ki, kim başqasını olmayan keyfiyyətinə görə tərifləyərsə, təriflədiyi adama xeyir gətirməz. Çünki, təriflənən onda belə bir keyfiyyətin olmasını zənn edərək xeyir əməllərdən və inkişafdan əl çəkə bilər. Peyğəmbər (s) buyurur: **“Məddahların üzlərinə torpaq tökün!”** (Müslim 4/2297) Ömər (Allah ondan razı olsun!) deyir ki, *tərif qurban verməkdir*. (“Fəthul Bari” 10/477)

Həmmam bin əl-Haris rəvayət edir ki, bir kişi Osmanı mədh edirdi. Miqdad bunu görüb kiçik daş dənəciklərini onun sifətinə atdı. Osman dedi: *“Sən nə edirsən?”* O, dedi: Həqiqətən, Allahın rəsulu buyurdu: **“Əgər məddahlar görsəniz, onların sifətlərinə torpaq atın!”** Başqa bir rəvayətdə Miqdad deyir ki, *Allahın rəsulu (s) bizə məddahların sifətinə torpaq atmağımızı əmr etdi*. (Müslim 4/2297)

## TƏRIFIN ICAZƏ VERILIDIYI HALLAR

Şübhə yoxdur ki, mədh etmək mədh olunanın fitnəyə düşməsinə səbəb olursa və ya həddən artıq tərifə yol verilirsə, bu, dilin törətdiyi bəlalardandır. Lakin, belə olmadığı təqdirdə bunu bəla adlandırmaq olmaz.

Imam Buxari (Allah ona rəhmət etsin!) “Kim qardaşını olduğu keyfiyyətinə görə tərifləyərsə” fəslində qeyd edir ki, Səd belə rəvayət edir: *“Peyğəmbərin yalnız Əbdürrəhman bin Salam barəsində yer üzərində gəzən Cənnət əhli deməsini eşitdim”*. (Buxari 7/87 “Fəthul Bari” 10/478)

Musa bin Uqbə Salimdən, o da atasından rəvayət edir ki, rəsulullah (s) paltarın aşağı düşməsini qeyd edəndə Əbu Bəkr dedi: *“Ey Allahın rəsulu, mənim də paltarımın bir tərəfi aşağı düşür”*. Rəsulullah (s) ona cavab verdi: **“Sən onlardan deyilsən”.** (Buxari 7/87 “Fəthul Bari” 10/478)

Bu icazə verilən istisna haldır. Lakin, tərifləyərkən mübaliğəyə, fitnəyə və təriflənən insanda özünü bəyənmə kimi

hisslərin yaranmasına yol vermək olmaz. Göründüyü kimi, peyğəmbər (s) səhabələri (Allah onlardan razı olsun!) gözəl sifətlərlə vəsf etmişdir. Peyğəmbər (s) Ömər barəsində deyir: **"Şeytan sənin getdiyin yolda səninlə qarşılaşmaz. Ancaq, sənin getdiyin yoldan başqa yolda görükə bilər".** (Müslim 4/1864 Buxari "Fəthul Bari" 10/479) Kim başqasını bilindiyi xüsusiyyətinə görə tərifləyərsə, bu qadağan olunmuşlar siyahısına daxil edilməz. Peyğəmbər (s) şerlərdə, xütbələrdə və söhbətlərdə mədh edilmişdir. Və onu mədh edənlərin sifətinə torpaq atılmamışdır. ("Fəthul Bari" 10/477)

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) deyir ki, iki səhih kitabda üzə tərif etmək barəsində çoxlu hədislər varid olub. Alimlər qeyd edirlər ki, onun qadağan olunmuş forması mübaliğəyə, fitnəyə və təriflənən insanda özünü bəyənmə kimi hisslərin yaranmasına yol verməkdir. Lakin, təqvası, əqli və mərifəti belə bir fitnənin yaranmasına rəvac vermədiyi insanların üzünə tərif demək qadağan deyil. Əksinə, onun xeyir əməllərə fəallığını və davamlılığını artırır. Allah ən gözəl biləndir. (İmam Nəvəvinin "Müslimin şərhi" 18/126)

## İNSANIN ÖZ ƏMƏLİN AŞKARA ÇIXARMASI

Əbu Hureyrə (Allah ondan razı olsun!) peyğəmbərdən (s) belə eşitdiyini rəvayət edir: **"Mənim bütün ümmətim bağışlanandır. Yalnız günahlarını bəyan edən istisnadır. Çox biabırçı bir haldır ki, insan gecə bir əməl edə, səhər oyanarkən Allah onun ayıbını örtdüyü halda, o deyər: Ey fılankəs, mən dünən belə etdim. Gecə də Allah onun eyibini örtdüyü halda, səhər yenə də onu aşkara çıxarar".** (Buxari 7/89 Müslim 4/2291 Bax; "əl-Lulu val Mərcan" 3/326)

## MÜSƏLMANLARI SÖYMƏK VƏ LAĞA QOYMAQ

Allah taala buyurur: **“Ey iman gətirənlər! Bir qövm digərini lağa qoymasın. Ola bilsin ki, onlar (lağa qoyulanlar) o birilərindən (lağa qoyanlardan Allah yanında) daha yaxşı olsunlar. Qadınlar da bir-birinə (rişxənd eləməsinlər). Bəlkə, onlar (rişxənd olunanlar) o birilərindən (rişxənd edənlərdən) daha yaxşıdırlar. Bir-birinizə tə’nə etməyin (ayıb tutmayın) və bir-birinizi pis ləqəblərlə (ey kafir, ey fasiq, ey münafiq və i. a.) çağırmayın. İman gətirdikdən sonra fasiq adını qazanmaq necə də pisdir. Məhz tövbə etməyənlər zalımlardır”.** (əl-Hucurat, 11)

Əbu Hureyrə (Allah ondan razı olsun!) rəvayət edir ki, rəsulullah (s) buyurur: “**Səhabələrimi söyməyin! Canım əlində olana and olsun ki, əgər sizlərdən biriniz Uhud dağı boyda qızıl xərcləsəniz, yenə də onların etdiyi bir əmələ, hətta yarısına belə çatmaz”.** (Müslim 4/1967 “Şərhun Nəvəvi” 16/93)

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) deyir: *“Bil ki, səhabələri (Allah onlardan razı olsun!) söymək ən çirkin haramlardan biridir. Istər onların fitnəyə uğrayanı olsun, istər olmasın. Çünki, onlar bu müharibələrdə nələrisə ictihad etmişdilər”.* (“Şərhun Nəvəvi” 16/93)

Əbu Zər (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu eşitmişdir: **“Bir insan başqasını fasiqlik və ya küfrlə ittiham etdiyi halda dediklərində yalnışdırsa, o özü onlardandır”.** (Buxari “Fəthul Bari” 10/464 Əhməd “Müsnəd” 5/181)

Abdullah bin Məsud peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Müsəlmanı söymək fasiqlik, öldürmək isə küfrdür”.** (Buxari 1/17 Müslim 1/18 Bax; “əl-Lulu val Mərcan” 1/13)

Abdullah bin Ömər (Allah ondan və atasından razı olsun!) rəvayət edir ki, peyğəmbər (s) buyurur: **“Bir kişi müsəlman qardaşına “ey kafir” deyərsə, onlardan biri**

**həmin kəlmədən olar”.** (Buxari 7/97 Müslim 1/79 Bax; “əl-Lulu val Mərcan” 1/13)

Müslimdə olan rəvayətdə isə **“Bir insan müsəlman qardaşı üçün “ey kafir” deyərkən doğru olarsa, o biri ziyana uğrayar. Yox əgər səhv olarsa, dediyi özünə qayıdar”** deyilir. (Müslim 1/73)

Əbu Hureyrə (Allah ondan razı olsun!) rəsulullahın (s) belə buyurduğunu rəvayət edir: **“Bir-birinə söyüş söyən iki nəfər məzluma zülm etməyiblərsə, onların günahı söyüşü başlayandadır”.** (Əbu Davud 4/274) Bu hədisin mənası ondan ibarətdir ki, bir-birinə söyüş söyən iki nəfərin günahı söyüşü başlayana yazılar. Əgər burada məzluma zülm edilibsə, onu söymək və zülm etmək daha günah olduğundan hərənin günahı öz boynuna yazılar. Allah ən gözəl biləndir. (Bax; Əbu Davudun “Sünən”inin şərhi “Övnul məbud” 13/237)

Əbu Zər (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə dediyini eşitmişdir: **“Kim bilə-bilə atasından başqasını atası olduğunu iddia edərsə, küfr edər. Kim onun olmadığı birşeyi özününkü iddi edərsə, bizdən deyil və onun üçün oddan hazırlanmış yerini hazır bilsin! Kim başqasını kafir və ya Allahın düşməni olmadığı halda belə adlarla çağırarsa, dedikləri özünə qayıdar”**. (Müslim 1/80) İmam Nəvəvi deyir: “Bəzi alimlər bu hədis barəsində bir neçə fikir söyləmişlər. Çünki, hədisin zahiri nəzərdə tutulan fikrlə eyni deyil. Heç vaxt haqq tərəfdarları ölüm, zina və hətta, müsəlman qardaşına “ey kafir” deməklə edilən günaha görə kimisə kafir adlandırmır. Buna görə də hədisin yozumunda bəzi məqamlar var:

1. Müsəlman qardaşını küfrdə təqsirləndirən adam yanılarsa, başqasını boş yerə günahkar adlandırdığına görə günah qazanar.
2. Bu hədis möminləri kafir adlandıran xavariclərə aiddir. Bu fikir Qadı İyadın İmam Malikdən (Allah ona rəhmət etsin!) nəql etdiyi rəydir. Ancaq, bu, zəif

rəydir. Çünki, xavariclər məsələyə başqa cür yanaşırlar. Onlar başqaları kimi yox, özlərinə məxsus şəkildə kimlərisə küfrdə ittiham edirlər.

3. Başqasına kafir deməklə insan günaha öyrəşir. Günahları etdikcə isə gözündə kiçilir və küfrə yol vermiş olur.
4. Başqasını küfrdə günahlandırdığı özünə qayıdır. Bu, həqiqi küfr deyil, müsəlman qardaşını kafir adlandırdığına görədir. O, özünü kafir adlandırmış kimi sayılır.

**“Kim bilə-bilə atasından başqasını atası olduğunu iddia edərsə, küfr edər”** kəlamına gəlincə, bu, mümkün olmayan bir iddiadır. Həmin insan nemətə, Allahın haqqına küfr etmiş, nankor olmuş olur. Atasından başqasının atası olduğunu iddia etmək, insanı dindən çıxardan küfr anlamına gəlməz. Peyğəmbər (s) hədislərin birində qadınlara “Siz küfr edirsiniz” dedikdən sonra, bu küfrün onların yaxşılığı və rəfiqələrini küfr etməkdən ibarət olduğunu açıqladı.

Yuxarıda qeyd olunan hədisin tam mətni Müslimdə belə rəvayət olunur: **“Ey qadınlar, sədəqə verin və Allahdan çoxlu bağışlanma diləyin! Mən sizi Cəhənnəm əhlinin əksəriyyəti görürəm”**. Qadınların içərisindən biri dedi: *“Ya rəsulullah, bizi cəhənnəm əhlinin əksəriyyəti edən nədir?”* Dedi: **“Siz çoxlu lənət yağdırırsənız və rəfiqələrinizi küfr edirsiniz. Mən əqli və dini zəifliyi ən çox sizdə gördüm”.** Qadın dedi: *“Ya rəsulullah, əqli və dini zəiflik nədən ibarətdir?”* Dedi: **“Əqli zəifliyə gəlincə, bilmək lazımdır ki, iki qadının şahidliyi bir kişinin şahidliyinə bərabərdir. Dini zəifliyi isə onun gecə namazlarına durmaması və ramazan ayını orucsuz keçirməsidir”**. (“Səhihi Müslim” 1/68)

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) deyir ki, adətən bəziləri xoşuna gəlmədikləri insanlara qarşı “uzunqulaq”, “it”, “qoyun” və bu kimi pis ifadələr işlədirlər. Bu cür ifadə işlətmək

iki aspekdən günahdır: birincisi, yalan, ikincisi isə başqasına əziyyət verməkdir. (Nəvəvi "Zikrlər" 314)

Kiməsə söyüş söymək, təhqir etmək şəriətə müxalif əməllərdəndir. Hətta, heyvanlara, quşlara qarşı pis ifadələr işlətmək olmaz. Zeyd bin Xalid rəvayət edir ki, peyğəmbər (s) buyurur: **"Xoruzu söyməyin! O, sizi namaza oyadır".** (Əbu Davud 4/327 Bax; "Səhih əl-Cami" 6/161)

## VALIDEYNLƏRI SÖYMƏK

Insanın öz valideynlərini söyməsi böyük günahlardan biridir. Abdullah bin Amr bin As (Allah ondan və atasından razı olsun!) rəsulullahın (s) belə buyurduğunu rəvayət edir**: "İnsanın öz valideynlərini söyməsi böyük günahlardandır".** Dedilər: *Ya rəsulullah, insan öz valideynlərini söyərmi*? Dedi: "**Bəli, biri başqasının atasını söyər, o da qayıdıb onun atasın söyər. biri başqasının anasını söyər, o da qayıdıb onun anasını söyər".** (Buxari 7/69 Müslim 1/92 Bax; "əl-Lulu val Mərcan" 1/3)

## LƏNƏT YAĞDIRMAQ

Lənət etmək Allahın rəhmətindən qovmaq və uzaqlaşdırmaq deməkdir. Lənət yağdırmaq, tənə etmək, çirkin və təhqiramiz ifadələr işlətmək möminin sifətlərindən deyil. Əksinə bu, zəif imanı olan fasiq insanların daşıdıqlar norma və xüsusiyyətlərdir.

Sabit bin Dahhak (Allah ondan razı olsun!) rəsulullahın (s) belə buyurduğunu rəvayət etmişdir: **"Mömini lənətləmək, onu öldürmək kimidir".** (Buxari 7/223 Müslim 1/104)

Əbu Hureyrə isə (Allah ondan razı olsun!) rəsulullahın belə buyurduğunu rəvayət edir: **"Siddiq olana lənət yağdırmaq yaraşmaz!"** (Müslim 4/2005 Tirmizi 4/371)

Əbu Dərdadan (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Lənətçilər Qiyamət günü şəfaətçi və şahid olaraq durmayacaqlar”**. (Müslim 4/2006 Əbu Davud 4/278)

Səmra bin Cundubdan (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Bir-birinizi Allahın lənəti, qəzəbi və odla lənətləməyin!”** (Tirmizi 4/350 Həmçinin, bu hədisin həsən-səhih olduğunu qeyd etmişdir. Əbu Davud 4/277)

İbn Məsud (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət etmişdir: **“Mömin tənə edən, lənət oxuyan, çirkin əməl və biədəb dil sahibi ola bilməz”.** (Tirmizi 4/350 O, bu hədisin həsn olduğunu qeyd edib.)

Əbu Dərda (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət etmişdir: **“Həqiqətən, qul bir şeyə lənət oxuduqda, lənət səmaya qalxır. Səma qapıları onsuz bağlanır. Sonra yerə enir. Yerin qapıları da ona bağlanır. Sonra lənət sağa-sola fırlanmağa başlayır. Yer tapmadıqda lənət edilən insan lənətə layiqdirsə, ona istiqamət alır. əks təqdirdə, lənət oxuyana qayıdar”**. (Əbu Davud 4/277)

Ibn Abbas (Allah ondan və atasından razı olsun!) rəvayət edir ki, bir kişi peyğəmbərin (s) yanında küləyi söyür. Peyğəmbər (s) bunu görüb deyir: **“Küləyi söymə! O, əmr olunanı yerinə yetirir. Kim bir şeyi layiq olmadığı halda lənətləyərsə, lənət onun özünə qayıdar”**. (Əbu Davud 4/278 Tirmizi 4/351 Şeyx Əbdülqadir, Nəvəvinin “Zikrlər” kitabını tədqiq edərkən bu hədisin səhih olduğunu qeyd etmişdir. Səh 302 Bax; “Səhih Tirmizi” 2/189 “Tuhfətul Əhbazi” 6/112)

İmran bin Həsin (Allah ondan və atasından razı olsun!) rəvayət edir ki, rəsulullahın (s) səfərlərinin birində ənsar qadınlarından birinin mindiyi dəvə hirslənir. Bunu görən qadın dəvəni lənətləyir. Rəsulullah (s) qadının dediklərin eşidirdə deyir: **“Onun üzərində olduğu heyvanı götürün! Çünki, o**

**lənətlənmişdir".** Imran deyir ki, *ondan sonra ona bir nəfərin də toxunduğunu görmədim*. (Müslim 4/2004)

Əbu Bərza (Allah ondan razı olsun!) isə rəvayət edir ki, bir cariyə üzərində camaatın azuqəsi olan bir dəvəni minmişdi. Yorğunluq insanları narahat etdiyindən qadın dəvəni lənətləyir. Bunu eşidən rəsulullah (s) deyir: **"Üzərində lənət olan bir dəvə bizimlə yol gedə bilməz"**. Başqa bir rəvayətdə isə **"Üzərində Allahın lənəti olan bir heyvan bizimlə yol gedə bilməz"** deyilir. (Müslim 4/2005)

## LƏNƏT YAĞDIRMAĞIN ICAZƏ VERILDIYI HALLAR

Günah sahiblərini və kafirləri ümumilikdə lənətləmək olar. Lakin, xüsusi ad çəkərək kiməsə lənət oxumaq olmaz. Buna şəriətdə icazə verilmir.

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) deyir: "Bil ki, xüsusi kimisə lənətləmək icma alimlərin rəyinə əsasən haramdır. Lakin, aşağıdakı kimi günahla vəsf olunanlara lənət oxumaq mümkündür. Məsələn, "Allah zalımlara lənət eləsin! Allah kafirlərə lənət eləsin! Allah fasiqlərə lənət eləsin! Allah yahudilərə və nəsranilərə lənət eləsin! Allah şəkil çəkənlərə lənət eləsin!" kimi ifadələr işlətmək olar. (Nəvəvi "Zikrlər" 303) Daha sonra alim başqa dəlillər gətirməyə başlayır. Onlardan:

1. Peyğəmbər (s) buyurur: **"Allah yahudilərə və nəsranilərə lənət eləsin! Onlar peyğəmbərlərinin qəbirlərini məscid etdilər".** (Müslim 1/376 Buxari 2/90)
2. Peyğəmbər (s) buyurur: **"Allahdan başqası üçün qurban kəsənlərə Allah lənət etsin! Bidətçiyə dəstək verənə Allah lənət etsin! Valideynlərinə lənət oxuyana Allah lənət etsin! Torpaq**

**məsafəsini dəyişdirənə Allah lənət etsin!”** (Müslim 3/1567)

3. Cabirin rəvayət etdiyi hədisdə peyğəmbər (s) üzü damğalanmış uzunqulağı gördükdə deyir**: “Allah ona damğa vurana lənət etsin!”** (Müslim 3/1673)
4. Peyğəmbər (s) buyurur: **“Ey Allahım, Allaha və rəsuluna asi olan Ral, Zikvan və Asiyyəyə lənət et**!” (Müslim 4/1953) Bunların üçü də Ərəb qəbilələridir.

Hədislərin zahirinə əsasən yahudi, nəsnari, zalım, zinakar, şəkil çəkən, oğru, sələmçi və bu kimi günahkarların birini qeyd edərək ona lənət oxumaq olmaz. Imam Qazali belə hallarda yalnız küfr üzərində öldüyü təsbit edilən kəslərə lənət oxumağın icazəli olduğunu qeyd edir. Məsələn, Əbu Ləhəb, Əbu Cəhl, Firon, Haman və bu kimi adlar haqqında danışdığımıza misaldır. Çünki, lənət Allah taalanın rəhmətindən uzaqlaşdırmaqdır. Biz isə günahkarın və ya kafirin sonunun nə olacağını bilmirik. (Nəvəvi “Zikrlər” 304)

Hər şeyin doğrusunu Allah bilir. Qazali qeyd edirdi ki, xüsusi olaraq heç kəsə adını çəkərək lənət oxumaq olmaz. Çünki, biz insanların hansı əqidə ilə öləcəyini bilmirik. Hətta, kafirin də sonunun nə olacağını bilə bilmərik. Tarix nə qədər elə insanların şahidi olmuşdur ki, onlar əvvəlcə küfr və günah içərisində olmuş, sonradan Allah onları hidayət etmiş, həyatlarını xeyir üzərində başa vurmuşlar. Batilin köməkçiləri olduqları halda, Allah onları haqqın tərəfdarlarına çevirmişdir. Ancaq, rəsulullah (s) ölüləri söyməyi qadağan etmiş və bəyan etmişdir ki, onlar artıq etdiklərinin qarşılığını alırlar. Peyğəmbər (s) buyurur: **“Ölüləri söyməyin! Artıq onlar etdiklərinin qarşılığına nail olurlar”**. (Buxari “Fəthul Bari 3/258 və başqaları) Tirmizidə Muğirə bin Şöbədən rəvayət olunan hədisdə isə peyğəmbər (s) buyurur: **“Ölüləri söyməyin ki,**

**dirilərə əziyyət verməyəsiniz!”** (Tirmizi 4/353 Bax; “Səhih ət-Tirmizi” 2/190 Bu hədisi Əhməd də rəvayət etmişdir.)

## ALLAH VƏ FILANKƏS İSTƏSƏ və ya ALLAH VƏ FILANKƏS OLMASAYDI demək

Huzeyfə (Allah ondan razı olsun!) peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **“Allah və fılankəs istəsə - deməyin! Lakin, Allah istəsə, sonra fılankəs istəsə - deyin!”** (Əbu Davud 4980, 4/295 Əhməd “Müsnəd” 5/384 və başqaları)

Yalnız “Allah istəsə” və ya “Allah istəməsəydi” demək ən gözəl deyiliş formasıdır. “Allah istəsə sonra fılankəs istəsə” və ya “Allah istəməsəydi, sonra fılankəs olmasaydı” deməkdə də heç bir qəbahət yoxdur. Lakin, “Allah və fılankəs istəsə” və ya “Allah və fılankəs olmasaydı” demək qadağandır.

## OLMUŞ HADISƏLƏRI ALLAHIN QƏDƏRINƏ BURAXMAMAQ

Əbu Hureyrə (Allah ondan razı olsun!) rəsulullahın (s) belə buyurduğunu rəvayət edir: **“Güclü mömin zəif mömindən xeyirlidir. Bütün xeyir işlərdə sənə nə fayda verir, ona can at! Allahdan kömək dilə! Aciz olma! Sənə bir bəla üz verdikdə, “belə etsəydim, bu cür olardı” demə! Lakin, “Allahın qədəridir, istədiyini edər” de!**” (Müslim 2664, 4/2052)

## İNSANLAR MƏHV OLUB demək

Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **“Əgər insan “camaat məhv olub” deyərsə, (bilsin ki) o, insanların ən çox məhv olanıdır”.** (Müslim 2623, 4/2024) Hədisin mənasına görə, belə

deyən insan məhvə məhv olmuşların ən pisidir. Alimlərin yekdil fikirlərinə əsasən, peyğəmbərin (s) bu kəlamı insanlara xor baxan, onları pisləməklə alçaldıb özünü yüksəltmək istəyənlər barəsindədir. Heç bir insan Allahın öz məxluqatı barəsindəki sirlərini bilə bilməz. Lakin, özünün və camaatın vəziyyətinin pis olduğunu görüb onların halına acıyan kimsələrin belə ifadələr işlətməsi qəbahət sayılmaz. (Bax; Nəvəvi "Səhih Müslimin şərhi" 16/175) Məhv olanların ən pisi kimi vəsf edilən insanlara, bu sözü deməklə başqalarını eyibləyən, insanların qüsurlarını biabır etmək məqsədi ilə yayanlar aid edilir. Həmin insanlar ən pis vəziyyətdə olanlardır. Bu cür ifadələrlə insan özünü yüksəlmək istədiyi halda, Allah qatında kiçilir və hörmətsiz olur.

## MUSİQİ VƏ QADAĞAN OLUNMUŞ ŞER

Allah taala Qurani-Kərimdə buyurur: "**İnsanlar içərisində eləsi də vardır ki, nadanlığı üzündən (tutduğu işin günahını anlamadan xalqı) Allah yolundan (islam dinindən) döndərmək və bu minvalla onu məsxərəyə qoymaq üçün mə'nasız (oyun-oyuncaq) sözləri satın alarlar. Məhz belələrini alçaldıcı bir əzab gözləyir. Və ayələrimiz ona oxunduğu zaman onları eşitmirmiş, qulaqlarında ağırlıq (karlıq) varmış kimi təkəbbürlə arxasını çevirər. (Ya Rəsulum!) Sən də ona şiddətli bir əzabla (axirətdə cəhənnəm odunda yanacağı ilə) müjdə ver!"**. (Loğman, 6-7) Səhabələr (Allah onlardan razı olsun!) Allahın kitabını ən gözəl bilənlərdir. İbn Məsud bu ayənin təfsiri barəsində üç dəfə bu sözləri deyir: *"Ondan başqa ibadətə layiq ilah olmayan Allaha and olsun ki, bu musiqidir.* (İbn Cərir bunu öz təfsirində qeyd etmişdir. Bax; "Təfsir İbn Kəsir" 3/442)

Peyğəmbər (s) buyurur: **“Ümmətimdən elə bir qövm olacaq ki, onlar ipəyi, içkini və çalğını halal hesab edəcəklər”. (Buxari “Fəthul Bari” 5590, 10/51) Allah taala buyurur: “İndi siz bu kəlama (Qur′ana) təəccübmü edirsiniz? Həm də gülürsünüz, heç ağlamırsınız! Siz (qəflət içində) oynayır-əylənirsiniz”.** (ən-Nəcm, 59-61)

Şer isə iki cürdür:

Birincisi, İslamı, müsəlmanları, haqqı və onun tərəfdarların mədh etməkdir ki, bu da icazə veriləndir. Ikincisi isə batil fikri və onu təstəkləyənləri mədh etməkdən və ya başqalarını haqsız olaraq təhqir və məzəmmət etməkdən ibarətdir. Bu isə haram və dilin törətdiyi ən böyük bəlalardandır.

Allah taala buyurur: **“(Müşrik və kafir) şairlərə gəlincə, onlara yalnız azğınlar uyar. Məgər görmürsənmi ki, onlar hər bir vadidə sərgərdan gəzib-dolaşırlar? (Hər tərəfə meyl edir, birini yalandan mədh, digərini isə əbəs yerə həcv edirlər!) Və onlar etmədikləri şeyləri deyirlər! (Onların dediklərinin əksəriyyəti yalandır!) Ancaq iman gətirib yaxşı işlər görən, Allahı çox zikr edən və zülmə uğradıqdan sonra intiqamını alanlardan başqa! Zülm edənlər isə (öləndən sonra) hansı dönüşə dönəcəklərini (hara qayıdacaqlarını, aqibətlərinin necə olacağını, hansı inqilabla sarsılacaqlarını) mütləq biləcəklər”.** (əş-Şuara, 224-227)

## YALANÇI VƏD

Peyğəmbər (s) buyurur: **“Münafiqin əlaməti üçdür: Danışanda yalan danışar, vəd edəndə vədinə xilaf çıxar, ona bir şey əmanət olunduqda əmanətə xəyanət edər”.** (Buxari “Fəthul Bari” 1/89 Müslim 1/78) Başqa bir hədisdə rəsulullah (s) buyurur: **“Kimdə bu dörd şey olsa, o, əsl münafiqdir. Kimdə bu dörd şeydən əlamət varsa, onu tərk edənə kimi onda nifaqın əlamətləri qalar: Ona bir şey əmanət ediləndə,**

**əmanətə xəyanət edər, danışanda yalan danışar, vəd edərkən vədini yerinə yetirməz, münaqişə etdikdə çirkin əmələ əl atar".** (Buxari "Fəthul Bari" 1/89 Müslim 1/18)

## YAXŞI İŞLƏRİ ƏMR ETDİYİ HALDA ƏMƏL ETMƏMƏK, PİS İŞLƏRDƏN ÇƏKİNDİRDİYİ HALDA ÇƏKİNMƏMƏK

Usəmə bin Zeyddən (Allah ondan razı olsun!) rəvayət olunur ki, peyğəmbər (s) buyurur: **"Qiyamət günü bir kişi gətiriləcək və oda atılacaq. Od əhli onun başının üstünə yığışacaq və ona deyəcəklər: Ey fılankəs, sən nə etmisən ki, bura düşmüsən? Sən deyilmiydin ki, bizə yaxşılıqları əmr edib, pisliklərdən çəkindirən? Deyəcək: Mən sizə yaxşılığı əmr edirdim, amma özüm əməl etmirdim. Pisliklərdən çəkindirirdim, amma özüm onları edirdim".** (Buxari 4/90 Müslim 4/2290 Bax; "əl-Lulu val Mərcan" 3/325)

Burada hədisin mənası o demək deyil ki, insan yalnız kamil səviyyəyə çatdıqdan sonra, yaxşı işləri əmr edib pis işlərdən çəkindirməlidir. Müsəlmanın üzərinə düçən iki vacib əməl var. Birincisi, yaxşı işləri özünə əmr etməli və nəfsini pis işlərdən çəkindirməlidir. Edilməsini vacib bildiyi əməlləri yerinə yetirməlidir. Ikincisi isə başqalarını bildiyi şeylər barəsində yaxşı işlərə çağırmalı, pis işlərdən çəkindirməlidir. Əgər insan xalis niyyət olmaq şərti ilə bu iki vacib əməldən birini yerinə yetirib, digərini tərk etsə, yerinə yetirdiyi qalar, tərk etdiyi ilə isə mühakimə olunar. Allah ən gözəl biləndir.

## ƏRLƏ ARVADIN SİRRİNİ AÇMAQ

Peyğəmbər (s) buyurur: **"Qiyamət günü Allah qatında insanların ən şərlisi qadını ilə yaxınlıq etdikdən sonra,**

**sirrini başqasının yanında danışandır".** (Müslim 2/1060) Bu əmanətə ən böyük xəyanətdir. (Bax; "Səhih Müslim" 2/1061)

## İSLAMDAN QEYRİ BİR MİLLƏTƏ AND İÇMƏK

Sabit bin Dahhak peyğəmbərin (s) belə buyurduğunu rəvayət edir: **"Kim yalandan İslamdan qeyri bir millətə and içərsə, o, dediyi kimidir. Adəm övladına bacarmadığı şeylərdə nəzir yoxdur. Kim bir şeylə özünü öldürsə, onunla da Cəhənnəm odunda ona əzab olunar. Möminə lənət oxuyan onu öldürmüş kimidir. Məminə küfr etmək onu öldürmək kimidir"**. (Buxari "Fəthul Bari" 10/464, 10/514 Müslim 1/105)

## GÜNAHKARI ƏZİZLƏMƏK

Bureydədən (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbə (s) buyurur: **"Münafiqə ağa deməyin! Əgər o, rəhbər olsa, Rəbbiniz Azzə və Cəllanı qəzəbləndirmiş olarsınız!"** (Əbu Davud 4/295 ən-Nəsai, Əhməd "Müsnəd" 3/346-347 Bax; "Səhih əl-Cami" 6/170)

## QIZDIRMANI SÖYMƏK

Cabir bin Abdullah rəvayət edir ki, rəsulullah (s) Ummu Saibin (və ya Museyyib) yanına gəlir və deyir: **"Sənə nə olub, niyə titriyirsən, ey Ummu Saib?** (və ya Museyyib) Qadın cavab verdi: *Qızdırmadır, Allah onu bitirsin!* Peyğəmbər (s) buyurdu: "**Qızdırmanı söymə! O, adəm övladının xətalarını aparır"**. (Müslim 4/1993)

## DİLİ QORUMAĞIN VACİBLİYİ

Imam Nəvəvi (Allah ona rəhmət etsin!) buyurur: “Bil ki, hər kəs dilini lazım olan şeylər danışmaqdan başqa bütün danışıqlardan qorumalıdır. Fayda və xeyir olan söhbətlər etmək, faydasız və xeyri olmayan söhbətləri tərk etmək peyğəmbərin (s) sünnətindəndir. Dili hər danışıq üçün istifadə etmək olmaz. Hətta, günah olmayan danışıq hərdən harama və ya xoşa gəlməyən bir hadisəyə gətirib çıxarır. Bu hamımızın eşitdiyi və şahidi olduğu bir məsələdir”. (Nəvəvi “Zikrlər” səh 284) peyğəmbər (s) buyurur ki, **Insana aid olmayan bir şeyi tərk etmək onun islamının gözəlliyindəndir”**. (Tirmizi 4/558 İbn Macə 2/1316 Bax; “Səhih Tirmizi” 2/269)

Şair deyir ki, *ey insan dilini qoru ki, səni sancmasın! O, bir ilandır. Qəbirlərdə dili onun qatili olduğu nə qədər insan yatır. Cavan dilinin büdrəməsi ilə ölür, ayağının büdrəməsindən ölmür. Dili ucbatından başını itirənlər gördüm, ayağı ilə canını qurtaranlar.*

Müsəlman gərək, onun dininə xeyir və fayda olan şeylərdən başqa dilindən boş və faydasız sözlər çıxartmasın! Danışmaq istəsə, baxsın ki, bunda xeyir var, yoxsa yox! Görsə ki, xeyir və fayda yoxdur, dilini danışmaqdan saxlasın! Dil qəlbinin aynasıdır. Insan istəsə də, istəməsə də qəlbini dediklərində əks etdirir. Yəhya bin Muaz deyir ki, *qəlb dolub daşan qazan kimidir. Insan danışarkən ona fikir versən onun qəlbinin nə olduğunu biləcəksən. Onun dili qəlbindən xəbər verir.* (“Hilyətul Övliya” 10/63)

Təəccüblüdür ki, insan haram yemək, zülm, zina, oğurluq, içki içmək, harama baxmaq və bu kimi əməllərə biganə yanaşır. Buna görə də dilini pis danışıqlardan çəkindirməkdə acizlik çəkir. Hətta, bu hal dindar və ibadət əhlində də müşayət olunur. Insan Allahın ona olan qəzəbindən elə sözlər danışır ki, ağlına gəlmədiyi halda bir sözə görə Cəhənnəmin məşriqlə

məğribin arasındakı məsafədən də uzaq bir yerinə daxil olur. Nə qədər insan var ki, dilləri yalanla, zülmlə, çirkinliklərlə, söyüşlərlə, lənətlərlə doluduğu halda özlərindən xəbərləri yoxdur. Bilmirlər ki, Allah taala onları dedikləri bir sözə görə əməllərini puç edər və Cəhənnəmə daxil edər. Müslimdə Cundubdan (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə peyğəmbər (s) buyurur: **"Bir kişi "vallahi, Allah fılankəsi bağışlamayacaq" dedikdə, Allah Azzə və Cəlla buyurar: "O kimdir ki, mənim adımdan fılankəsi bağışlamayacağımı söylədi. Mən onu bağışladım, ancaq sənin əməlini puç etdim".** (Müslim 4/2023) Bunu deyən Allaha ibadət edən biri idi. Allah isə onun bircə sözünə görə bütün əməllərini zay etdi.

Bir dəfə dünyasını dəyişmiş elm adamlarından birini yuxuda görürlər. Onun halı barəsində soruşanda deyir: *Mən hələ bir vaxtı "İnsanların yağışa necə də ehtiyacı var!" dediyimə görə sorğu-sual edilirəm. Məndən soruşuldu: "Sən nə bilirsən ki, qullarıma nə xeyirdir? Onu yalnız mən Mən bilirəm".*

Səhabələrdən biri cariyəsinə deyir: *"Süfrə aç, vaxtımızı keçirək!" sonra isə səhv etdiyini başa düşərək deyir: "Allah məni bağışlasın! Bu nə sözdür mən işlədirəm? Bu mənim iradəsizliyimdən irəli gəldi".* (Bax; İbn Qeyyim "Tutarlı cavab" səh 276/281)

İbn Bureydə rəvayət edir ki, İbn Abbas (Allah ondan və atasından razı olsun!) dilini tutaraq belə deyir: *"Vay sənin halına! Ya xeyir söylə ki, mükafatlanasan, ya da sus ki, salamat qalasan! Əks təqdirdə bil ki, peşman olacaqsan!"* İbn Abbasdan niyə belə dediyi barəsində soruşulanda belə cavab verdi: *"Qiyamət günü bədənin əzaları içərisində insana ən çox əzab gətirəcək olanı dildir. Dilindən yalnız xeyir üçün istifadə edənlər isə istisnadır".* (İbn Rəcəb əl-Hənbəli "Camiul ulum vəl hikəm" səh 241)

İbn Məsud (Allah ondan razı olsun!) Allaha and içərək bildirir ki*, yer üzərində ən çox həbsə möhtac bildiyim şey dildir.* (İbn Rəcəb əl-Hənbəli "Camiul ulum vəl hikəm" səh 242)

Yunis bin Ubeyd deyir: *Elə bir insan görmədim ki, dili güclü iradəyə malik olsun. Güclü iradəni yalnız başqa əməllərində gördüm*. (İbn Rəcəb əl-Hənbəli "Camiul ulum vəl hikəm" səh 242)

Bilmək lazımdır ki, əzaların ən yüngül hərəkət edəni dildir. Eyni zamanda dil insana ən zərərli əzadır. Alimlər ağızdan çıxan hər sözün, yoxsa təkcə savabın və günahın yazıldığı barəsində ixtilaf etmişlər. Daha doğru olan fikir birincisidir.

Dilin törətdiyi iki böyük bəla var. Onların birindən xilas olsan, digərindən xilas ola bilməyəcəksən: birincisi, batil danışmaq, ikincisi isə haqqı danışmamaqdır. Ayrı-ayrı vaxtlarda biri digərindən daha böyük günah olur. Haqqı danışmayıb onun barəsində susan adam lal şeytan kimi təsəvvür olunur. O, Allaha asi, riyakar, yaltaq və qorxaq olar. Batil fikirlər söyləyən isə danışan şeytandır. O, Allaha üsyankar olar. Insanlar onun dilindən zərər çəkərlər. Bu dində sabit olanlar isə dillərini batil sözlərdən qorumuşlar. Onu yalnız axirətləri üçün faydalı işlərdə sərf etmişlər. Onlar boş yerə və mənasız danışmazlar. Qiyamət günü dağlar boyda yaxşılıqlarla gələn insanlar olacaq. Lakin, baxıb görəcək ki, dili onun bu yaxşılıqlarının hamısını aparıb. Həmçinin, Qiyamət günü dağlar boyda günahla gələn insan olacaq ki, onları dili Allahı çoxlu zikr etdiyinə görə yuyub aparacaq. (İbn Qeyyim "Tutarlı cavab" 276-281)

Həqiqətən də qul qeyd olunan bu tövsiyyələrə qulaq asıb əməl etsə, nicat tapacaq. Uqbə bin Amir (Allah ondan razı olsun!) soruşur: Ya rəsulullah, nicat nədir? Rəsulullah (s) buyurur: "Dilini möhkəm tut, günahların üçün ağla! (Tirmizi 4/605 Bax; "Səhih əl-Cami" 1388)

# NƏTICƏ

Allaha həmd olsun ki, haqqında danışdığımız mövzu sona çatdı. Bacardığımız qədər dəqiq və diqqətli olmağa çalışdıq. Mövzu çox əhəmiyyətə malikdir. Gərək ki, tədqiqatçıların marağını cəlb etsin. Əgər dil ümməti cəm etmək və haqqı yaymaq üçün istifadə olunsa, onda bu müsəlmanların xeyrinədir, onunla yaxşı işlər əmr olunar, pis işlərdən çəkindirilər. Əgər dil İslam ümmətini parçalamaq üçün istifadə olunursa, onda bu cəmiyyət və fərd üçün zərərlidir. Dilin törətdiyi bəlalar özünü müsəlman cəmiyyətlərində və ailələrdə təhlükəli şəkildə birüzə verir. Dilin vasitəsi ilə ərlə arvad, qaldaşlar, dostlar, hətta dövlətlər arasında münaqişə yarana bilər.

Bu mövzunu yazarkən elmi əmanəti qoruyub saxladıq. Belə ki, rəy sahiblərini adları ilə qeyd etdik, hədislərin mənbələrini göstərdik, bacardığımız qədər zəif hədisə yer verməməyə çalışdıq. Imam Şafi (Allah ona rəhmət etsin!) buyurur ki, *Qurandan başqa bütün elmlər bir məşğələdir. Hədis və dini fiqh elmi isə istisnadır. Əsl elmə nail olmaq "fəlankəs rəvayət edir ki" deməklə mümkündür. Qalanları isə şeytan vəsvəsəsindən başqa bir şey deyil.*

Allahdan gözəl ad və sifətləri ilə bizim əməllərimizi ixlaslı etməsini, bizə faydalı elm, saleh əməl bəxş etməsini diləyirəm. O, hər şeyə qadirdir, dualari cavablandırandır. İzzət və Cəlal sahibi olan rəbbimiz vəsf olunanlardan ucadır, nöqsansızdır. Göndərilmiş bütün elçilərə salam olsun! Həmd aləmlərin rəbbi olan Allaha məxsusdur. Qulu, rəsulu və yaratdıqlarının ən xeyirlisi olan Məhəmmədə, onun ailəsinə, səhabələrinə və Qiyamət gününə kimi onlara gözəl şəkildə tabe olanların üzərinə Allahın salavatı, salamı və bərəkəti olsun!